# ملا نصر الدين

№16. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپک ۱٦




Pərvərdigara, görəsən bu qəzetələr mənim barəmdə nə yazırlar...



















Tiflis camaat darülfünununun müsəlman şö"bəsi

**ABUNƏ QİYMƏTİ**
Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д. 24.*

Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

E'lan qiyməti

Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

**11 rəbiül-axər, 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 19 aprel 1909**



## ƏDƏBİYYAT

Neyləyim, ey vay,
bu urus başdılar,
Bilməyirəm hardan
aşıb-daşdılar,
Ölkədə gündən-günə
çoxlaşdılar,
Hər əmələ, hər işə
çulğaşdılar,
Qoymayın, ay köhnələr,
ay yaşdılar!
Heyvərələr hər yerə
dırmaşdılar!

Hər biri min gunə iş icad edir,
Məclis açıb, nitqlər irad edir,
Şiə ikən sünniləri şad edir,
Sünni ikən şiəyə imdad edir,
Sanki bular bir-birə
qardaşdılar,
Yoxdu təəssübləri,
çaşbaşdılar.

Heç biri öz məzhəbinin
hörmətin
Gözləmiyir, gözləyir el
qeyrətin.
Cümləsi, bir yolda qoyub
niyyətin,
Xoşlamıyırlar atalar adətin.
Çünki nə sünni, nə
qızılbaşdılar,
Bir yava şeydir bu
başıdaşdılar.

Əmr təəssüb ola bətlal neçün?
Sünni deyə şiələrə can
neçün?
Şiə bilə sünnini insan neçün?
Birləşə yə'ni bu müsəlman
neçün?
Himmət edin, din gedir,
ay başdılar,
Qoymayın, aldatdı bizi
saşdılar.

İndi ki duyduz buların niyyətin,
Cəhd eliyin pozmağa
cəm'iyyətin,
Bunları pozmaq bizə
olmaz çətin,
Harda ki gördüz oxuyun
lə'nətin,
Hökm eliyin: küfrlə ulğaşdılar,
Dini-xudadan qırılıb qaşdılar,
Cümləsi, kafirlərə yoldaşdılar,
Çünki təəssübləri yox,
çaşdılar!

**Əbunəsr Şeybani**







## QƏYYUMLUQ KANTORU

Dinli, imanlı, ədalətli, ibadətli, ağzıdualı, əli təsbehli hacıları allah-taala dünyada nədən ötrü xəlq eliyib?

Ondan ötrü ki, ölülərimiz vəsi' və qəyyumsuz qalmasınlar və yurdları kor olmasın və mallarını zorba-zorlular yeyib-dağıtmasınlar və mövqufatlar ara yerdə puç olmasın.

Lakin Dağıstanda Petrovsk şəhərindən savayı bu mətləbi heç bir yanda indiyədək mülahizə eləmiyiblər. Belə ki, bir neçə il bundan irəli bu şəhərin ağzıdualı hacıları bir yerə cəm olub məhz allah rizası üçün hökumətin izni ilə və qazi cənablarının təsdiqi ilə bir qəyyumluq kantoru açıblar ki, hər bir müsəlman özünə qəyyum və vəsi' tə'yin etmək istəsə, həmin kantoraya rücu' eləsin ki, bəlkə ədalətli və ibadətli şəxslərin sə'y və təlaşı sayəsində heç bir müsəlmanın səğirlərinin hüququ mərdüməzarın ixtiyarına keçməsin.

Allah ömür versin, bu neçə ilin ərzində qəyyumluq kantorası göstərdiyi xidmətin intəhası yoxdur. Buradan çıxan saleh-qəyyum və vəsi'lər hələ indiyədək heç Naxçıvanda da görsənmiyib.

Sözümüzü sübuta yetirməkdən ötrü abdaad saya bilərik.

Petrovsk kantorasından şəhadətnamə alıb çıxan dindarların biri 1317-ci tarixdə vəfat edən Məlikməhəmməd Babayevə qəyyum olub və mərhumun tərəfindən imtiyazı alınan məktəbi tə'mir eliyib millət üçün bir böyük yadigar qoydu.

Həmin kantoradan şəhadətnamə alıb qəyyumluğa çıxanların biri də 1322 tarixdə həccə gedən günü vəfat edən bir dövlətliyə qəyyum olub və mərhumun altı yaşında qızını çığırda-çığırda qazinin köməkliyi ilə öz qardaşı oğluna nikah etdirib ki, dövlət əldən getməsin.

Kantoradan çıxan qəyyumların biri Səməqənddə Axund Hacı Molla Barat cənablarıdır, biri Danabaş kəndində Hacı Kərimdir. Xülasə, söz müxtəsər yaxşıdır.

"Molla Nəsrəddin" vasitəsi ilə ətraf və əknafa e'lan olunur ki, qeyr məmləkətlərdə hər bir kəsə əmin və ağzıdualı vəsi' və qəyyum lazım olsa, bu adres ilə istəsinlər: Petrovsk, Dağıstan, Baryatinskaya küçədə, qəyyumluq kantora rəisi Hacı filankəsə.

**Lağlağı**

## MÜJDƏ

Sünni və şiə ittihadı tərəfdarlarına müjdə:

Bu axır vaxtlarda qəzetələrdə ha oxuyurdum ki, gərək biz gecə və gündüz çalışaq sünni-şiə təfriqəsini aralıqdan götürək.

Amma mənim fikrimə bir belə şey gəlirdi ki, doğrudur, sünni və şiəliyi aralıqdan götürüb ancaq müsəlman olmaq lazımdır. Bununla belə, nə lazımdır ki, bu yolda həmi gecə çalışmaq, həmi gündüz çalışmaq? Gecəni allah qaranlıq yaradıb ki, məxluq yatıb dincini alsın, məgər kifayət eləməzmi ki, bircə gündüzlər çalışıb, gecələri rahat olmaq?

Mənim sözümə baxan olmadı və genə qəzetələrdə oxuyurdum ki, müsəlmanlara lazımdır gecə-gündüz ittihad yolunda çalışıb, biri-birilərinə arxa olmaq və nifaqı aradan götürmək.

Amma mən bilirdim ki, bədnəzərin bədnəzərindən qurtarmıyacağıq. Bilirdim ki, axırda bizə göz dəyəcək.

Elə belə də oldu.

Məsələn, bu günlər Qazax şəhərində şiələrin mədrəsəsindən üç sünni uşağını çıxardıb qovublar, məhz bu səbəbə ki, bu uşaqların üçünün də adı Ömər imiş.

Əgər bu xəbər yalandı, Qazax şiələrinin vəbalı olsun bu sözü yalandan icad edənin boynuna, əgər doğrudursa, şiələri tapşırdım yeri-göyü yox yerdən yaradan bir allaha.

İkinci müjdə də budur ki, Tiflis şəriətmədarlarımız qərar qoydular ki, açılmağı nəzərdə olan təzə ruhaniyyə mədrəsəsinin adını qoysunlar şiə məktəbxanası və oraya sünni tələbələrini qəbul eləməsinlər.

Mən bu sözləri burada ondan ötrü yazıram ki, bir də bir işə çalışanda, gecə və gündüz çalışmıyaq, çünki adama göz dəyər. Bircə gündüzləri çalışsaq kifayətdir. Yoxsa bu neçə ilin müddətində qəzetələrdə və məclislərdə həmişə çığır-bağır salmışıq ki, "ay müsəlman qardaşlar, gecə və gündüz də gərək sə'y edək müttəfiq olaq".

Gecələr sizə peşkəş olsun. Bircə gündüzlər çalışaq bəsdir.

**Hərdəmxəyal**

## MİLLƏT DOSTLARI

Bizim şəhərdə bir neçə rusca oxumuş müsəlman peyda olub: başlarında şapka, üzləri qırxıq, birisi də hələ student, çənəsində keçi saqqalı. Başlıyıblar ki, biz məscid məktəbinin xeyrinə teatr oyunu çıxardacayıq. Nə qədər dedik, "Balam, öz eybinizi bilin, teatr nədir, oyun nədir, onun pulunu müsəlman xərcləsə cəhənnəmdə yanar", bu zalımlar baxmadılar. Bir neçə dükançıları da yoldan çıxardıb bu aprelin 2-də bir hoqqabaz oyunu qayırdılar. Nə qədər istədim mən getməyəm, olmadı, durdum mən də getdim. Oyun nə oyun! Elə o yadımda qaldı ki, axırda beş-altı

bəylər gəldilər, bir yekə stol qoyub üstündə çaxır, araq düzüb, camaatdan utanmıyıb onların gözü baxa-baxa o qədər içdilər ki, hamısı keyfləndi. Sonra da dalaşıb bir-birini əzib dağıldılar, heç zad, adam tovlama. Hələ adını da qoyublar "millət dostları".

Və bir də bu tamaşaya gələn adamlara bir parça qırmızı kağız verirdilər, üstü də yazılı və deyirdilər ki, burada hər kəsin yeri yazılıb, hər kəs gərək öz yerində otursun. Bax, bu söz lap axmaq sözdür. Çünki bəlkə bir məşədiyə elə kağız düşdü ki, yeri qabaqda oldu. Birinə də eləsi düşdü ki, yeri geridə. Bəs layiqdimi, sən allah, məşədi qabaqda otura, bəy də dalda? Bu oyunçular bu mətləbi qanmamışdılar. Elə odu ki, heç kəs onların kağızına baxmadı. İgid adamlar gəlib düz qabaqda əyləşdilər, xançalı da dəstəsindən basdılar, bir kəs də oları dindirə bilmədi, dindirsə də qalmaqal düşərdi. Bu oyunçular əvvəla bir də belə hoqqabazlıq çıxartmasınlar, xudanəkərdə çıxartsalar da qansınlar ki, dalda, qabaqda oturmaq kimə lazımdır. Daha deməsinlər sənin yerin beşinci cərgədədir. Və bir təzə xəbər də budur ki, təbrizli Haşımın baydaqdarlarından birisi qaçıb gəlib bizim Qazağa, burada olub seyid, özü də mərsiyəxan. Bunun fikri budur ki, burada bir müstəbid dəstəsi yığsın. Novruz bayramı günü camaatı yığdı məscidə, ortaya qoydu bir qazan soyuq su, duadan-zaddan oxuyub üfürdü suya, sonra dedi: "Camaat, bu təhvil suyudur, hər kəs bu sudan evində saxlasın, hər növ dərdin dərmanıdır". Bu sözü eşidən kimi camaat məsciddən çıxıb evlərinə sarı belə qaçdılar guya qaradovoy dallarınca qovurdu. Niyə qaçırdılar? Evlərdən qab gətirməyə. Qab! Qab! Vallah, billah, tallah, qab gətirməyə. Məsciddə su üstündə bir bashabas düşdü, allah göstərməsin.

**Şəhri-Qazax,**
**imza: Məşədi Qasım**

## *MİLLİ MƏNZUMƏ*

Realni uşkolalarda müsəlman uşaqları həmişə dərsdən çıxanda oxuduqları təsnif:

O xal nə xaldı ora düzdürmüsən, A Mirzə,
Bir ilin müddətində bizə nə öyrətmisən, A Mirzə.

Saqqalı çal - A Mirzə,
Ağzı çuval - A Mirzə,
Bu xal nə xal - A Mirzə.

## *MUŞTUQ*

Bu urus tayfası doğrudan, çox xamdı.

Məsələn, mə'lumdur ki, urus məktəblərində falaqqa saxlamaq qadağandır və həmçinin uşaqları ağacnan döymək də qadağandır və hələ bundan savayı, uşaqlara çor demək də qadağandır.

Bu qərardad, əlbəttə, rus uşkolalarında dərs deyən elmi-ilahi müəllimlərinə xoş gəlmiyəcək idi və necə də xoş gələ bilərdi, bir surətdə ki şair deyib: "Tərki-adəti tərkitmək mövcib mərəzin naxoş olmağına səbəb ola bilər".

Yazıq fağır urus elə xəyal eliyib ki, müsəlman elmi-ilahi müəllimləri belə qərardada boyun əyib dəxi aciz qalacaqlar. Amma xeyr, bu xəyal xam xəyaldır.

Belə ki urus-müsəlman uşkolasında dərs verən müəllimlərimizin biri bir gün arşın yarım uzunluğunda bir yoğun muştuq çıxardıb başlıyır uşaqların birini döyməyə. Uşkolanın naziri şaqqıltının səsinə gəlir görsün ki, bu nə mə'rəkədir. Müəllim tez bir papiros çıxardıb taxır muştuqa və başlıyır çəkməyə və nazirə deyir ki, uşaq dərsini bilmirdi, mən ehmalca yapışdım qulağından, zırımpanı başladı. Nazir də müəllimin sözünə inanıb qoyub gedir. Vəssalam.

Onu demək istəyirdim ki, bu urus tayfası doğrudan, çox xamdır, elə bilir ki, falaqqanı və ağacı məktəblərdən götürmək ilə dəxi müəllimlərimizi məəttəl qoyacaq.

Muştuğun canı sağ olsun.

**Cırcırama**

## *YAXŞI ADƏT*

Molla əmi, qulaq ver sənə bir təzə xəbər söylüyüm. Amma çox eşitməli xəbərdir. A kişi, bizdə qəribə xəbərlər var imiş, heç birindən bizim xəbərimiz yoxdur. Atalar sözüdür ki, başına gələn başmaqçı olar. Mənim də başıma gəlməsəydi, hələ ölənə kimi xəbərim olmuyacaqdı.

Ayıb da olmasa, bizim Cəfəri Gəncə ətrafındakı Qazaxlar kəndindən evləndirmişdim. Hər işini tamam edib, bir neçə fayton adamla getdik gəlini gətirməyə. Elə ki kəndin bəri başından daxil olduq, gördüm ki, yolun ortasında qırx-əlli nəfər əli payalı kişilər durublar. Bizi görən kimi bir söz deməyib çəkib faytondan yerə salıb, paya bazarını işlətdilər. Molla əmi! Gözləriniz kor olsun görməsin! O ki lazımdır bizə kötək urdular. Kiminin başı yarıldı, kiminin qolu sındı, kiminin nə bilim nəyi qırıldı. Qərəz, bir saat belə urhaurdan sonra bizdən əl çəkib çəkildilər. Mən ölüm, özün insaf elə, mətləbi bilməmiş sən özün döyülsəydin, acıq etməzdinmi? Döyənlərin əllərindən qurtaran kimi yoldaşlara dedim, minin faytona geri qayıdaq! İstəyirdik ki, faytona minək, bu halda adamların arasından bir neçə nəfər aralanıb, yanımıza gəlib, bizə xoşgəldiniz elədilər. Acığım daha da tutdu. Yanımıza gələnlərdən birisi bizi belə görəndə dedi:"Bağışlıyın, bizim adətimiz belədir. Gəlin aparmağa gələni döyərlər". Bu söz məni sakit etdi. Çünki adətin qabağında nə demək olar? Bizim belə gözəl adətlərimiz azdırmı? Qərəz, sözü uzatmıyım. Gəlini faytona qoyub on sajın yol getməmişdik ki, birdən fayton dayandı. Qabağa baxıb gördüm ki, bir nəfər qəvi heykəl şəxs qollarını və qıçlarını çırmıyıb, faytonun qabağını kəsib deyir:"Ya adam gəlsin mənlə güləşsin və ya on

beş manat verib ötün!" Daha dalısını yazmıram. Bədənim başdan-ayağa indi də ağrıyır. Amma orasını söylüyüm ki, biz də onların iki qoyunlarını oğurladıq. Qız evindən şey oğurlamaq da bizim Gəncədə adətdir. Qərəz, səni and verirəm Hacı Mustafanın Şeyx Nizami barəsində etdiyi səxavətə, bu sözləri jurnalda yazgilən ki, özgə müsəlmanlar da bu gözəl adətdən xəbərdar olsunlar.

**Əztərəfi-dostunuz**
**Yoncasatan**

## *TELEQRAF XƏBƏRLƏRİ*

....................

**Bakı** - Mövlud peyğəmbəri bayramı "Səadət" məktəbindən ayın 17-də, "Kəramət" məktəbində ayın 12-də oldu. İttifaq və ittihada heç söz yox.

....................

**Aşqabad** - Bir para həmiyyətlilər vəfat etmiş bir şəxsin adına açılan bir məktəbin çox yaşamağı məsləhət olmadığını düşünüb "Müzəfferi" məktəbini açdılar.

....................

**Bakı** - Bu axırlarda şəhərin köhnə mədəniyyəti sönür, ləzzəti qaçır. Dəxi nə güllə səsi eşidilir, nə də qan selləri görünür. Deyəsən indiki Bakı müsəlman şəhəri deyil, sakit murdar "malakan" kəndidir.

....................

**Hacıtərxan** "Edil" qəzeti hey'əti böyük bir mitinq qurub hökumətin teatrları ruslaşdırmaq silkinə şiddətli protest etdi.

....................

**Tehran** ,,,,,,,,,

....................

**İstanbul** - Kərbəlayı Əbdülhəmidi bir köhnə səbətə qoyub vermişdilər bir hambalın dalına ki, şəhərdən çıxardıb aparıb salsın zibil qutusuna. Deməginən səbət dəlik imiş. Az qalmışdı ki, yazıq kişi düşüb şikəst olsun.

....................

**Tokio** - Əbdürrəşid İbrahimovun məqalələri yazılan "Bəyanülhəqq" nömrələri buranın hər mə'bədinə gəlir. Yaponiyalılar onları müqəddəs kitab kimi saxlıyıb ehtiram göstərirlər.

....................

**Gəncə** - Buranın məktəbinin türk dili müəllimiliyinə bir nəfər çox yaxşı müsəlmanca bilən, amma həmişə urusca danışan müəllim tə'yin olundu. İnşallah, türk dili bu müəllimin sayəsində tez tərəqqi edəcəkdir.

## *NİCAT*

Genə iranlılara nicat yolu bəlkə Gədəbəy mə'dənində olan iranlılar tərəfindən açıla.

Belə ki, bu günlərdə buraya üç nəfər dərviş gəlib və gecələr mənzillərdə Hüseyn Kürddən, Həmzeyi-sahibqırandan və Qüreyş Buxarayidən leksiya oxuyurlar ki, bəlkə cavanların qanı cuşə gələ.

Genə İranda nicat yolu bəlkə bu dərvişlərdən açıla.

## *PUL TURŞUSU*

Yekaterinodar şəhərində sakin olan iranlılar öz aralarında dörd yüz altı manat yığıb tapşırmışdılar iki məşədiyə və bir məşədi kandidatına ki, bu ağalar pulları göndərsinlər Təbriz aclarına.

Doğrudur, məşədilər pulları göndərəcək idilər Təbrizə, amma qorxublar ki, yolda istidən pullar qoxub puça çıxalar. Və bu səbəbdən məşədilər dörd yüz altı manatı qoyublar turşuya ki, xarab olmasın. Hər kəs inanmasa, and olsun Molla Şükür axundun naməhrəm övrətlərinin məməsinin arasına əlini salıb həkimlik eləməyinə ki, bu yazılan əhvalatda bir tikə xilaf yoxdur.

## *MİTİNQ*

İrəvan gimnazistlərinin çoxusu böyük bir mitinq qurdular və bu fəsilləri oradaca qərar qoydular. Əvvəlinci fəsil: Müsəlman gimnazistləri bu gündən tutmuş uzun çuxalılarla və qara papaqlılarla gərək görüşüb-danışmasınlar. İkinci fəsil: O gimnazistlər ki, ataları və ya qardaşları uzun çuxa geyirlər və qara papaq qoyurlar, gərək evlərində qalmasınlar, urus pansionuna verilsinlər. Üçüncü fəsil: Tezlikdə gimnazistlər öz aralarında pul yığıb dövlət Dumasında olan müsəlman vəkillərinə bir tel vursunlar ki, onlar (vəkillər) vəsatət eləsinlər tainki İrəvan gimnazistlərinin illərdən bəri oxumaqdan beynini qaraldan və birCə qəpiklik mənfəət vermiyən ana dilini bunların içindən götürsünlər.

**İmza: Simürğ**

## *NƏ SƏBƏBƏ?*

Nə səbəbə bu il Gəncədə mədrəseyi-ruhaniyyə cənab peyğəmbərin anadan olmağını rəbiyələvvəlin 17-də bayram elədi?

Bunun səbəbi budur ki, neçə vaxtdan bəri Gəncədə danışırmışlar ki, guya mədrəsədə uşaqları sünni eləmək istəyirlər. Ayın 17-də bayram eliyib uşaqları ötürdülər ki, xalqın arasında dağılan xəbər yalana çıxsın. Mə'lumdur ki, Bakıda da ayın 12-də bayram saxladılar. Bunun səbəbi budur ki, Bakı şiələri (vəbalı deyənin boynuna) guya dindən çıxıb sünniliyi qəbul eləmək fikrindədirlər.

Qərəz ki, əhvalat belə olub.

E'LAN

O mübarək ağzım ilə üfürdüyüm təhvil suyundan bir neçə butulka ehtiyat üçün saxlıyıram. İki həftə bundan əqdəm üç butulka London şəhərinə göndərmişəm. Parijdən də və qeyr mö'təbər şəhərlərdən də sifariş gəlməkdədir.

Mö'min müsəlman qardaşlar fürsəti itirmiyib vaxt ikən istəsinlər. Butulkası yeddi manat yarımdır. Naloj ilə səkkiz manat yarım.

Adres: Şuşada qazi cənablarına.

## E'LAN

Gəncəyə gələn müsafirlərə lazım bilirik xəbər verək ki, biz cümə günləri vağzala gəlmiyəcəyik. Çünki cümə günləri Gəncə mehmanxanaları keyf çəkən müsəlman cavanları ilə dolu olur və düşməyə yer olmur.

**İmza: Faytonçular**

## POÇTA QUTUSU

.....................

Cavad uyezdində "Allanan"a: Qur'an ayəsini məcmuəmizə yazmağı və bu barədə danışmağı lazım bilmirik.

.....................

Gəncədə "Gəncə şairi"nə: 17-ci nömrədə çap olunar.

.....................

Aşqabadda Hacı Molla Əbdüləli rozəxan şirvaniyə: İdarəmizə göndərdiyiniz məktubu oxuduq, amma heç təəccüb etmədik. Mərsiyəxanlarımızın ağzından və qələmindən nalayiq sözlərin törəməyi bir qəribə iş deyil. Sizin barənizdə məcmuədə yazdıqlarımız böhtan da olmuş olsa - biz o böhtanları özgə qəzetələrdən götürüb yazdıq. Bununla bərabər, genə həmin yazdıqlarımızı təsdiq edib deyirik ki, bizə göndərdiyiniz məktubun ustadından hər bir çirkin iş baş verə bilər.

.....................

Aşqabadda "Bacadanbaxan"a: Yazdığınız xəbərlər çap olunmalıdırlar, amma heyf ki, sizi tanımırıq.

Ordubadda məxsusi səyyahımız Məşədi Mozalan bəyə: Məktubunuz 17-ci nömrədə çap olunacaq.

Tiflisdə zərgər Qazizadəyə: Pulunuzun bizə çatmağı dəftərlərimizdən görsənmir. Zəhmət çəkib gələsiniz idarəmizə.

İrəvanda "Dəllal"a: Heç vəch ilə çap edə bilmənik.

Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə.

## E'LANLAR

**"Kitabül-bəyan"**

adlı təfsirimiz iki cilddə tamam oldu. Hədiyyəsi cildsiz 3 manat 50 qəpik, mücəllid 3 manat 90 qəpikdən 4 manat 50 qəpiyədək. Poçta xərci 80 qəpik.

Тифлисъ, Воронцовская ул., фабричный тупикъ, д. N2.

Гаджи Ахундъ Мовла-заде.

Təzə açılan
"KAFE LONDON"

Qalovinski küçədə, Mantaşevin evində, nömrə 6.

Obşestvennoye sobraniyanın altında Məhz Lakedrə və kampaniyasının mə'dən və meyvə suları (limonadları), həmçinin qəhvə, çay, şokolad, kakao, süd, qatıq, morojni, hər cür pivə, soyuq zakuskalar, isti pirajkilər və qurabiyələr.

Təmizlik və səliqə intəha mərtəbədədir. Fəvvarəli bağçası. Ehtiram ilə Niparidze və kompaniyası.

**Badkubədə Mehmanxaneyi - "İslamiyyə"**
**Гостиница "ИСЛАМИЯ" въ гор. БАКУ.**

**Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aspazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasroptsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".**

**Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.**

**Баку, Губернская ул., номера "ИСЛАМИЯ", телефон 1251.**

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə, Varonsovski - Vrangelski küçələrinin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

Jurnalın hər bir nüsxəsinin qiyməti Ələkbərovun dükanında 12 qəpikdir. Əldə satanlarda 15 qəpikdir.

E'lan və abunə qəbul etmək üçün də vəkilimiz həmin Məşədi Əyyub Ələkbərovdur.

## E'LAN

Kitabxanamızda hər cür məktəbə və maarifə dair kitablar mövcuddur: Kitabi-təşrihəl-fəraiz, Risaleyi-zübdətül-əhkam, Ümdətül-əkham, Əcəm dili, Uşaq bağçası, Nəsihətül-ətfal, Tərcümeyi-töhfeyi-nəsvihə və Təfsirül-Qur'an, Əsəri-Mollazadə və Təbrizin xəritəsi 60 qəpiyə və Mirati-vətən hər biri 15 qəpikdən Hacı Ələsgər Məhəmmədzadə kitabfüruş dükanında satılır.

**Tiflisdə Mehmanxaneyi-"Dağıstan"**
Nömrələrinin qiyməti yarım manatdan üç manata qədərdir. Hər cür Asiya və Avropa xörəkləri gətirtmək olar. Təmiz və işıq nömrələrimiz çox rahatdırlar.
Pasportsuz qonaqlar zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.
Adresimiz: Tiflis, Peskovski küçədə, nömrə 93, təzə müalicəxananın qabağında, konka duran meydanın yanında.
Sahibi mehmanxana: İsa Kərbəlayı Cəfər oğlu gəncəli.

**Тифлисъ, Песковская ул., д. № 93, противъ новой лечебницы д-ра Григорьяна номера "ДАГЕСТАНЪ"**

**Tiflisdə çıxan**
**"KAFKAZSKAYA ARMİYA"**

qəzetinin müdiri cənab B.S.İsadze təvəqqə edir davada yaralananlardan, şikəst və xəstə olanlardan, zəhmət çəkməyə imkanı olmuyanlardan və davada tələf olan və fövt olanların əyal və uşaqlarından - hər millətdən olsa, yuxarıda ad verilən qəzetə idarəsinə tezlikdə öz barələrində müfəssələn aşağıda yazılan mə'lumatı göndərsinlər: 1. Şikəst olanın familiyasını, adını və atasının adını, 2. onun mənsəbini və hansı polkda qulluq edirdi, 3. haralıdır və indi harada olur, 4. evlidirmi, subaydırmı və nə qədər uşağı var, 5. harada yaralanıb və şikəst olub (şəhadətnamə göndərməli), 6. hansı naqradları var, 7. hüsniəxlaq barəsində hökumətdən şəhadətnamə.
Bu mə'lumat ondan ötrü lazımdır ki, əvvəla, şikəstlərə ianə olsun və ikinci - onların uşaqları Tiflisin yanında açılan yetimxanaya götürülsünlər.

**E'LAN**

İki nəfər gimnaziya qurtaran urus qızları müsəlman evində qız və oğlan uşaqlarına tərbiyə və dərs vermək istəyir. Altıncı klasadək dərs verə bilərlər. Özgə şəhərə də getməyi qəbul eliyirlər. Xahiş edənlər "Molla Nəsrəddin" idarəsindən soruşsunlar.

**İDARƏMIZDƏ SATILAN KITABLAR**

| Kitabların adları | Yazanlar | Qiymətləri | |
|---|---|---|---|
| | | idarədə | poçta xərcilə |
| Dərs kitabları: | | | |
| Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dəsr kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dəsr kitabı | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: | | | |
| Təsrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəi-tərəqqi (farsca) | -*--*--*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıb-zadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*--*--*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*--*--*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*--*--*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*--*--*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıb-zadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*--*--*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbəy Cavanşir (milli şe'r məcmuəsi) | -*--*--*- | 25 qəp. | 30 qəp. |

***Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik. Nalojnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.***

IV ГОДЪ ИЗДАНИЯ № 16 АПРЕЛЯ 19-ГО 1909г.

# “Молла Насрединъ”

*КОНТОРА и РЕДАКЦІЯ*
*журнала*
“Молла Насрединъ”
Тифлисъ
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКІЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

**ЦѢНА на ГОДЪ**
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
**ЦѢНА за ОБЪЯВЛЕНІЯ**
*За место занимаемое строкою*
*петита впереди текста .....10 коп.*
*позади * * * .....7 коп.*

Müsəlmanların təbəəlik vergisi

Ay axund, biz sizə bir kök qaz verdik, siz də heç olmasa bizə onun yumurtasını verin, nəinki sərçə yumurtasını.

İslambul faciəsi




Yaxşı fürsətdir, çünki su bulanmıyınca bu zəhrimar balıqları tutmaq olmur. Amma qismət olsa, nə yeməli balıqlardı...

# ملا نصرالدين

№17. Цѣна 12 к. **МОЛЛА НАСРЕДДИНЪ** قیمتی ۱۲ قپیک ۱۷





Təzə Osmanlı sultanı beşinci Məhəmməd Rəşad




Qoy gəlsinlər, vallahi, bu kitab ilə onların cavabını verə bilərəm.

Пусть идутъ: этой книгой я дамь имь ответь…

| |
|---|
| **ABUNƏ QİYMƏTİ**<br>Qafqazda və Rusiyada:<br>12 aylığı - 5 manat<br>6 aylığı - 3 manat<br>3 aylığı - 1 manat 60 qəpik<br>Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat<br>6 aylığı - 4 manat<br><br>Nüsxəsi idarəmizdə - 10 qəpik<br>Özgə şəhərlərdə - 12 qəpik |

| |
|---|
| **İdarə və kantor**<br>*Tiflis, Davıdov küçəsi, nömrə 24.*<br>*Тифлисъ, Давидовская ул., д. 24.*<br><br>**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**<br><br>Тифлисъ, "Молла Насреддинъ"<br>**Редакция журнала "Молла Насреддинъ"**<br><br>**E'lan qiyməti**<br><br>**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**<br>**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.** |

**18 rəbiül-axər, 1327, bazar — Həftədə bir dəfə çıxan türk məcmuəsidir — 26 aprel 1909**

## "TƏHRİRƏL-MƏRAH VƏ "ƏLMƏRAHÜL-CƏDİDƏT"

Alimi-məşhur Qasımbəy Əmin ərəbcə yazdığı və ədibi-möhtərəm Zakir Əlqadiri cənabları türk dilinə tərcümə etdiyi həmin kitablar xanımları əsarətdən qurtarmağa dair şirin dil və mə'nalı dəlillər ilə bəhs edirlər.
Övrətlərin azadlığını arzu edənlərə bu kitabları alıb oxumağı məsləhət görürük. Hər birinin qiyməti 35 qəpikdir. Xahiş edənlər Orenburq quberniyasında Orsk şəhərində Əhməd Əlishaqi cənablarından istəsinlər.
г.Орскъ, Оренбургск. губ. Ахмеду г.ИСХАКОВУ.



1897







1888

"PRAVODNİK" şirkətinin

*Tiflis, Salolak küçəsində, nömrə 4.*
*Тифлисъ, Сололакская ул. № 4.*

Zaqafqaziyada fabrika anbarı
Tə'mirat mövsümü münasibəti ilə

# Проводникъ-Линолеумъ

Pravodnik-linoleumu
alıb otaqların fərşinə döşəməyi məsləhət görürük.

Linoleum olan yerdə dəxi parket, polların rənglənməyi, nəqşi, fərşi, qalı-qalça, kənarə, müşənbə və qeyr şey lazım deyil. Hər qisim fərşə döşənən şeylərdən linoleum o barədə yaxşıdır ki, cövhəriyyatın tə'sirindən xarab olmur, yeriyəndə səslənmir, asan təmizlənir və həmişə gözəldir.

Özü ucuz ola-ola linoleum
möhkəmlikdə, asanlıqda və göyçəklikdə indiyədək şöhrət tapan cəmi otaq
fərşlərinin cümləsindən birinci yer tutur.
Buna da şahiddirlər haman töhfələr və təsdiqnamələr ki,
"Pravodnik" şirkətinə rus və əcnəbi sərgi-
(выставка) lərində verilibdir.

Linoleumun nəqşləri və hesabı tələb olunan kimi göndərilir.



## CAVANLAR

Gətdi məni lap təngə
bu biar cavanlar,
Urdu sinəmə gör necə
odlar cavanlar.

Keçmişdə əcəb nazilə
dövran sürər idim,
Bimaneyi-əğyar nə hörmət
görər idim,
İnsanları mən aləti-ruzi
bilər idim,
İndi eliyibdir günümü
tar cavanlar.

Gah məktəbü, gəh
mədrəseyi-tazə açarlar,
Hər mədrəsəyə gündə
bir əndazə açarlar,
Tainki xəlayiq oxuyub
yazə açarlar
Ki, varı yox eylər, yoxu
da var cavanlar.

Hər yerdən olardı bizə
bir beş şahı vasil,
Bu tazə cavanlar çəkib
indi ona hail,
Eylərlər onu mədrəsə
sandığına daxil,
Hər işdə olublar bizə
sərkar cavanlar.

Keçmişdə bir əmrim
olur idi mənim icra,
İndi sözümü xəlq eləyir
başqaca mə'na,
İndi eləyiblər nə deyim
korları bina,
İzhar qılıb gör necə əsrar
cavanlar.

Bərqəsd əvam saxlar idim
xəlqi-cəhani
Kim, qanmıyalar hərgiz
olar yaxşı-yamani,
Faş eylədilər indi bular
sirri-nihani,
Həm eylədilər mətləbi
izhar cavanlar.



İndi bizə bidinlər edər
əmri-maarif,
Hər yerdə açarlar nə
bilim nəşri-maarif,
Məqsud budur əsr ola
bir dəhri-maarif,
Xəlqi edələr arifü huşyar
cavanlar.



Xəlq anlasa gər mətləbi,
təkfirə inanmaz,
Nə hiyləyə, nə "fəndə",
nə təzvirə inanmaz,
Nə moizəyə, həm nə də
təqrirə inanmaz,
Ax! Eylədilər işləri düşvar
cavanlar!



Getdi, dəxi gəlməz bilirəm
bir də o çağım,

Söndürdü xəlayiq nə
yaman yerdə çırağım,
İşrətdən əlim çıxdı, dəxi
yoxdu damağım,
Gördü mənə bu fəqri
səzavar cavanlar,
Biar cavanlar!

**Gəncə şairi**

## TELEQRAF XƏBƏRLƏRİ

**Şamaxı**- Sarılıq piri həmd olsun, elə tə'sir göstərir ki, ziyarətinə gedən hacıların nəinki gözlərini, hətta beyinlərini də sapsarı eliyir.

**Orenburq** - "Din və məşəqqət" mühərriri İstabbulun 31 mart mollalarını teleqraf ilə imdada çağırır ki, mərhum Əhməd bəyin yarım milyonluq vəqflərini əllərinə keçirib şəriəti qüvvətləndirsinlər.

**Şuşa** - Fəqir uşaqların mənfəətinə yığılan teatr pulunun çoxu təzə üçlük yaşıl kağızlar olmağına görə çəyirtgələr onları yaşıl buğda güman edib ləzzətlə yeyirlər.

**Ağdaş** - Müəllim Səid və Akif əfəndilərin hümmətilə "Nümuneyi-ədəb" məktəbi açılacaq.

**İstanbul** - Avropa muzeyxanaları indidən bir neçə milyon frank təklif edirlər ki, Əbdülhəmidin meyidini alıb "mumiya" yapsınlar və onu istibdad nümunəsi olaraq camaata göstərməklə milyonlar qazansınlar.

**Molla Nəsrəddin**

Biz avropalılara məsləhət görürük ki, bir az səbir etsələr, həm ikisini birdən ələ gətirərlər, həm də yarı qiymətə alarlar.

**Hacıtərxan** - Buranın bir para mollaları öz təcrübələrilə iddia edirlər ki, insan küçədə üzüaçıq arvad görəndə heyvan təbiətinə girərmiş.

**Şəki** - Ruhi-şərifləri cənnətə "təşrif" buyuran Hacı əfəndi vəfat etdi. Eyvah, şəkililərin çırağı söndü. Hacı əfəndinin açdığı üsulicədidə mədrəsə və məktəbləri başsız qaldı. Seyidlik ocağının nuru şəkililərin üstündən əskik oldu.

Bundan sonra bəxtləri lap qaralıb kömürə dönəcək. "Tərəqqi".

**Orenburq** - Mədrəseyi-Hüseyniyyə müdirinin ixtira etdiyi üsul ilə tələbələrə elə asan və yüngül dərs verirlər ki, müəllimlərə heç bilik və zəhmət lazım deyil.

**Tehran** - Şah, Əbdülhəmid məşrutəsini e'lan etdi.

**Axısxa** - Buranın bəy və mollaları İstanbulun 31 mart igidlərini teleqrafla təbrik etdilər.

**Bağçasaray** - "Əbdülhəmidin mə'lum və müsəlləm kəmalati-siyasiyyə və durbin nəzəri" aləmi heyran qoyur.

**Kazan** - Füqəra malını yeyən, müsəlmanların tərəqqilərinə mane olan imam və işanların məl'unluğu və onlara tabe olmağın haramlığı haqqında keçən il Kazan ülemasının yazdıqları fitvanı Zəbirov və Əhmədov cənabları duxovni sobraniyaya göndərib təsdiq etdirdilər.

**İsfahan** - Az qalmışdı ki, bəxtiyarlılar hücum edib Tehranı zəbt etsinlər.

**İstanbul** - Dağıstanlı Murad bəy aprel başında İstambul dərəsini xəlvət görüb özbəylik və nəcabətini e'lan etdi.

**Qori** - Buradakı darülmüəlliminin müsəlman şö'bəsində mərsiyə dərsləri olmadığından şagirdlər islam dinini yadlarından çıxardılar. Ümid ki bu il mərsiyə dərsi artırılıb müsəlmanların narazılıqlarına yol verilmiyə, şö'bənin köçmək məsələsi də bununla tamam ola.

**İrəvan** - Müsəlmanlar zəncəbil çörəyini yedikcə şişib kökəlirlər.

**Tiflis** - İran tacirləri və Qafqaz xanları bu fikirdədirlər ki, Tiflisdə üç yüz min manatlıq bir teatr tikdirsinlər.

**Molla Nəsrəddin**

Bu barədə Culfa, İrəvan, Bakı və qeyrə şəhərlərdən də çoxlu təbrik teleqrafları aldıq.

**Nuxa** - Burada sünnilər qərar qoydular ki, təzə açdıqları banqa bundan sora şiələrə yol verməsinlər. Şiələr də əlacsız qalıb əlahiddə şiə banqı açmaq fikrindədirlər.

**Təbriz** - Vəlləhidlər əyləşdiyi Şəmsül-ümərа Təbriz mücahidləri tərəfindən axtarıldıqda ən gizlin olan bir evdə mükəmməl surətdə bir ləqəb maşinası tapılmışdır. Maşinanın yanında hazırlanmış bir neçə yeşik ləqəb də varmış. O cümlədən: Biarül-soltan, Rübahüd-dölə, Xınzirül-məmalik, Dovşanüs-səltənə, Xəlaülmülk ləqəbləri də varmış.

## YAMAX

Çürümüş parçanın dəxi faydası yoxdur: bir yandan yamadın, o biri yandan cırılacaq.

Bu gün gördüm ki, yetim iranlılar sevincək qaçırlar konsulxanaya ki, Məhəmmədəli şah tərəfindən məşrutənin təzə e'lan olunmağı barəsində konsula mübarəkbadlıq versinlər.

Dünən görürdüm ki, qərib osmanlılar qaçırlar konsulxanaya ki, təzə sultanın taxta çıxmağından yana konsula "mübarək olsun" desinlər.

Mən bunu görəndə Cəfərin şalvarının gündə bir dəfə cırılmağı yadıma düşdü. Biçarə uşağın anası oğlunun şalvarını bu gün yamardı, sabah şalvarın bir özgə yeri cırılardı; çünki parça dəxi çürümüş idi.

Hələ buradan bir haşiyə çıxaq: Möhtərəm "Tərcüman" qəzetəsinin 15-ci nömrəsində oxudum: "Buxarayi-şərifdə şəfaxana

var - təbibləri rusdur, poçtaxana var - mə'murları rusdur, teleqrafxana var - teleqrafçılar rusdur, dəmir yolu var - mübaşirlər rusdur, polisa var - naçalniklər rus olacaqdır və halonki Buxara hökuməti rus gimnaziyalarına yüz minlərcə pul ianə edə-edə üçbeş cavanı rus məktəblərinə təhsil üçün göndərməyi lazım bilmədi".

Oxucularımdan təvəqqə edirəm ki, bu sözü səhl saymasınlar, ondan ötrü ki, Buxara da şalvarın bir hissəsidir.

.....................

Mən bircə bunu istəyirəm biləm ki, aya, müsəlman məmləkətlərində məşrutə asan vəch ilə baş tuta bilərmi, ya yox?

Mən elə qanıram ki, oxucularımızın heç biri mənim sualıma cavab verə bilməz. O səbəbə ki rus kitablarını oxuya bilmiyən müsəlmanlarımız indiyədək hələ bilmiyiblər və eşitmiyiblər ki, aya, məşrutə nə deməkdir. Nə fars dilində və nə türk dilində bu barədə bir kitab yazılmıyıb. Müsəlman qəzetələrinin bə'zisində bir para qırıq-quruq mətləblər yazılıbsa da çoxdan yaddan çıxıblar və bir də o mətləblər ərəb dilində yazılıb.

Söhbətdən uzaq düşdük.

Mən bircə bunu istiyirəm biləm ki, aya, müsəlman məmləkətlərində məşrutə asan vəch ilə baş tuta bilərmi, ya yox?

Əgər hamı birdən mənə cavab versə ki, "xeyr, baş tuta bilməz" - mən qələmi qoyaram yerə və sözümü qurtararam.

Amma əgər "hə" deyən olsa, o və'də bir papiros yandırıb söhbətdə bir az davam edərəm.

.....................

Məşrutə deyilən bir elə şeydir ki, neçə yüz il bundan irəli İngilisdə baş verib Avropa məmləkətlərini dolana-dolana indi gəlib düşüb biz müsəlmanların içinə. Biz də hər bir Avropa elminə yaxşı deyə-deyə məşrutəyə yaxşı deyib istiyirik ki, biz də buna sahib olaq. Amma bunu yadımızdan çıxardırıq ki, məşrutə yamaq götürən zəhrimar deyil. Bunu qəbul eliyən gərək çürük şalvarı ayağından çıxardıb bilmərrə ata kənara.

Dünyada məşrutənin bircə mə'nası var. Bunun mə'nası budur ki, bir məmləkətin millət vəkilləri bir yerə cəm olub təzə qanunlar icad eliyirlər və millət də borclu olur o qanunlardan qədəm kənara qoymasın.

Oxuculardan təvəqqə edirəm ki, iki kəlməyə diqqət eləsinlər: **təzə qanun**. Əlbəttə, millət vəkilləri vəz' etdiyi qanunlar gərək təzə olsunlar. Aşkar şeydir ki, təzə olan yerdə köhnə qanunlar gərək pozulsunlar.

Bu zarafat deyil. Burada çox düşünmək lazımdır...

Hər bir insaf əhli bu mətləbi zaiqəyə tapşırsa, gərək razı ola və yəqin eliyə ki, məşrutə deyilən mərdimazar işlərin biridir. O səbəbə ki, bir gün əgər millət nümayəndələri istəsələr, yığışıb bir belə qanun çıxarda bilərlər ki, məsələn, bundan sora bacı ilə qardaş gərək ata malından bərabər irs aparsınlar, nəinki bacı bir hissə və qardaş iki hissə.

İndi mən də məşrutə tərəfdarlarından soruşuram: Aya, millət vəkillərinin bir belə qanun çıxartmağa ixtiyarı var, ya yox? Əgər yoxdur - dəxi bu məşrutə olmadı, əgər var - elədə Tehranda Şeyx Fəzlullahdan və İstanbulda "İttihadi-Məhəmmədi" firqəsindən dəxi nə səbəbə narazıyıq?

.....................

Məşrutə üsulu ilə idarə olunan məmləkətdə hər bir şeyi gözləmək olar. Bir gün ola bilər ki, millət vəkilləri bir belə qanun yazalar:"Əgər on iki yaşında bir qız qoltuğuna kitab vurub üzüaçıq məktəbə gedən yerdə bir məşədi o qıza deyə:"Üzünü ört, bihəya", o və'də haman kişiyə gərək tənbeh oluna, çünki azad məmləkətdə yolnan keçənə bir söz demək olmaz".

İndi mən də məşrutəşünaslardan soruşuram: Aya, millət vəkillərinin bir belə qanun icad etməyə ixtiyarları var ya yox? Əgər yoxdur - dəxi bu məşrutə olmadı, əgər varsa, elədə Hacı Mirzə Həsəndən və məşrutənin sarıqlı düşmənlərindən inciməyə nə haqqımız var?

.....................

Hələ bunlar keçəndən sonra ortalığa "hürriyyəti-din" söhbəti gələcək. Onda canımızı hara qoyacağıq? Onda Avropaya nə cavab verəcəyik?

Hələ çox əngəllər var. Hələ harasıdır?..

.....................

Xülasə, sözümüzdən uzaq düşdük.

Bu gün eşidirəm ki, Məhəmmədəli şah on doqquzuncu dəfə məşrutəni təsdiq elədi. Dünən eşitdim ki, Şeyx Əbdülhəmidi taxtdan yendirdilər. Ola bilər ki, sabah da əmiri-Buxara məşrutə məşqinə düşə.

Amma bunlar hamısı mənim nəzərimə yamaq kimi bir şey gəlir. Qorxuram elə hey bir ucdan yamıyasan, o biri tərəfdən cırıla.

Allaha pənah.

**Molla Nəsrəddin**

## E'LAN

Cənab "Molla Nəsrəddin" məcmuəsinin vasitəsilə cəmi şəhərlərdə sakin olan tacirlərə e'lan edirəm ki, bizim təzə açılan dəllal mağazinində hər cür zaqraniçni şagirdlər mövcuddur. Özüm də Hacı adamam, ürəyim də nazik, şagirdləri skidka ilə satıram və pulu olmuyan xozeyinlərə altı il və'dəyə də satıram. Xahiş edənlər bu adresə rücu' etsinlər: Vladiqafqaz, Musulmanski meydanda, telefon nömrə 8613245. Qarnıyoğun hacı.

## E'LAN

Təzə açdığım şipyon mehmanxanama hər tərəfdən gəlmə müsafirlər qəbul olunurlar. Mehmanxanamızda şvetsar, xazyayka və hər cür Asiya və Avropa xörəkləri və içgiləri mövcuddur. Nömrələrin qiyməti çox ucuzdur. Ərizə yazdıranlar da qəbul olunur saat 6-dan 12-yə qədər. Adres: Naxçıvanda mö'minlər küçəsində.

## ƏDƏBİYYAT

Çatlayır, xanbacı,
qəmdən ürəyim,
Qavışıb lap acığımdan
kürəyim.
Nola bir evdə qoyaydız
qarabaş,
Vermiyəydiz məni bu əbləhə kaş.

Mən ki damdan-bacadan
baxmaz idim,
Su kimi hər tərəfə
axmaz idim,
Hərzə-hərzə danışıb
gülməz idim,
Ər nə şey olduğunu
bilməz idim.

Oturub ac komasında atamın,
Biş-düşün hazır edərdim
anamın,
Bitliyirdim nənəmin
baş-yaxasın,
Yamıyırdım babamın
çul-çuxasın.

Tez durub sübh sağardım
inəyi,
Xansənəmdən diləməzdim
köməyi,
Neyliyirdim bəzəyi ya düzəyi,
Dama-divara yapardım təzəyi.

Atam əllaf, babam dülgər idi,
Qardaşım culfa, əmim
kargər idi,
Xan bibim falçı, nənəm
bağtoxuyan.
Bizdə haşa yox idi bir oxuyan.
Evimizdə var idi hər nə desən,
Qatıq, ayran ilə qaymaq,
nə yesən,
Nə bilirdik nə zəhirmardır
kitab?
Biz olan evdə haçan vardı
kitab?
Büsbütün gül kimi insanlardıq,
Nə müəllim və nə dərs
anlardıq,
Dəftərin andıra qalmış sözünü,
Eşidib görməmiş idik üzünü.

Böylə bir tərbiyəli evdə
müdam,
Bəslədiz mən kimi bir
sərvü xuram.
Vay o gündən ki məni ad
elədiz,
Elə bildiz də ki dilşad elədiz.

Mən də sandım ki,
dönüb bəxtəvərə,
Gedirəm bir nəfər insana ərə.
Nə bilim, böylə də insan
varmış,
Şəkli-insanda da heyvan
varmış.

Ər oxurmuş da, yazarmış da,
atam!
Ər deyil, mühlik azarmış da,
atam!
Ər deyil, şair imiş xanəxərab,
Fikri yazmaq, oxumaq,
şüğlü kitab.

Saldız axırda yaman hala
məni,
Ərə verdiz də bu qəffalə
məni.
Gah yazır, gah oxuyur,
gah danışır,
Gündə bir hərzə kitabnan
tanışır.
Gah gedir fikrə, bərəldir
gözünü,
Məhv olur öylə ki, bilmir
özünü.
Sübh olunca gecələr darğa
kimi,
Yatmıyır, qır-qır edir qarğa
kimi.
Gahda bir yatsa da
vaxtında əgər,
Çəkmiyir yuxladığı bir o qədər.
Qəflətən bir də görürsən ki,
durur,
Yandırıb lampanı çıplaq oturur.
Başlıyır yatdığı yerdə təzədən,
Oxuyub yazmağa bir də
təzədən.

Belə od olmaz, atam,
boylə alov!
Od deyil, yanğı deyil, lovdur,
lov...
Gah görürsən ki, miz üstə
yıxılır,
Baxıram halına qəlbim sıxılır.
Bir qarandaş, bir-iki parə
kağız,
O qədər çəkmir olur qarə
kağız.
Xeyrini, şərrini qanmır bu kişi,
Yorulub bircə usanmır bu kişi.
Bizim evdə baxasan hər
tərəfə,
Taxçaya, boxçaya ya kim
irəfə,
Görəcəksən bütün işkafda
kağız,
Kasada, nimçədə, boşqabda
kağız...
Yığılıb dağ kimi hər yanda
kitab,
Evdə, dəhlizdə, eyvanda
kitab...
Deyirəm, ay kişi, gəl bir
özünə,
Bu nə işdir, a kül olsun
gözünə!
Bu əməl etdi səni xanəxarab,
Pulların döndü bütün oldu
kitab.
Oxuduqca gözünün qarəsini
Aparır, tap başının çarəsini.
Pul gedir, tabü təvanın da
gedir,
Üstəlik bir quru canın da
gedir.
Kəsbükarından əlin çıxdı,
usan!
Ər olan yerdə görüm yox
olasan!

**(Məbə'di var)**

**Əbunəsr Şeybani**

## "YEŞİN BACI"

Biz uşaqlıqda bir neçə uşaq bir yerə cəm olub gündüzlər məhəllədə "Yeşin bacı" oyunu oynardıq. Belə ki birimiz bir ağacın dalında gizlənib xəbər verərdik "Yeşin bacı, gəl". Yoldaşlar da gəlib bizi tapardı. İndi dünya tərəqqi edib. Hər iş kamil olduğu kimi, bu oyunun kamil və ə'lasını Danaçıda şeyxlik edən Hacı Şüeyb əfəndi bilir. Bu lotu biz uşaqlar kimi gündüz yox, gecələr qaranlıqda mürid və cavan övrətlər ilə oynuyur və özü də biz kimi ağac dalında yox, mələk mislli cavan övrətlərin arasında gizləndiyindən onu heç tapmaq olmur. İslam aləminə bu üsuli-cədid "Yeşin bacı"nı mə'lum etməyi lazım bilirik.

**İmza: Sofi zənbil**

***(Sklad salonunda ziyafət)***

## CULFADAN

İrandan bu günlərdə Rusiya tərəfinə keçən cənab Mütrübül-məmalik Culfada müqim bə'zi hümmətli iranlılar tərəfindən kəmali-təntənə ilə istiqbal olundu. Əziz qonağın təşrifi münasibətilə keçən həftə ziyalı cavanlar tərəfindən sklad salonunda bir ziyafət verildi. Ziyafət bə'dində cənab Mütrübül-məmalik üsuli-cədid üzrə təzə ixtira etdiyi sənədlərdən nişan verdi. O cümlədən havada məəlləq vurmaq və başı yerdə, ayaqları havada oynamaq kimi məharətlər nişan verib, əcnəbi millətlərə öz güclərini bildirdilər. Ancaq bu arada bir qanlı iş zühur etdi isə dərhal islah edilib məclisin binası və hazirun möhtərəmlərin zövq-səfası xəlaldar olmadı. O aradan bir nəfər qərəz əhli ayağa durub iranlılara bu nitqi oxuyur: "Camaat, siz iranlılar indi bu yerdə isti otaqda çay, təam qabağınızda ləzzətlə məşğulsunuz. Amma sizin qardaşlarınız, bacılarınız Ələkbər xanın qorxusundan Əraş çayının içində vaqe dar bir cəzirəyə doluşub qalmaqdadırlar. Rusiyaya keçməyə pasport pulu yox, İrana keçməyə əmniyyət. İyirmi günlərlə çörək üzü görmüyüb ələfat ilə məişət edən adamlar da vardır". Bu sözdə camaatdan birisi qalxıb dedi: "Kəs səsivi, babı balası babı!!! Hər sözün bir yeri vardır". Bundan sonra məclis əksəriyyət ara ilə işi protokol edib Ordubad mədrəsəsində vaqe təkfirxanaya

göndərirlər. Onların hamısı keçəndən sonra cənab Mütrübülməmalik bir yaxşı sövt və bir dilrüba nəva ilə bu iki fərdi oxuyub əhli-məclisə dua etdi. Fərdlər bunlardır: İm şəb, pərişəb, pəs pərişəb bəğəli mamacan lala kərdi! Bexuda kar ki nəkərdi. Əzbəhrima kiş qəhri nümudi səfa kərdi! Betu azad nəkərdi. Yek pirəhəni-ətlas bədənəm parə-parə kərdi. Bevücudəm cəfa kərdi. Hazirun alqışladılar.

**İmza: Şikəmpərəsti-irani**

## DAXİLİ XƏBƏRLƏR

**Hacıtərxan** - Aprelin səkkizində "Çernef" hamamında pəhlivanın arvadı sərməst (piyan) halında Yaqodinin arvadının başını tas ilə vurub yaralamış. Yaralını xəstəxanaya apardılar. Sərməst arvadı polisa güc-bəla ilə hamamdan çıxardı.

Molla Nəsrəddin: Bunda təəccüb ediləcək bir şey yox!

Yalnız "içki haramdır" sözü kişilərimizi piyanlıqdan saxlıya bilmədiyi kimi, yalnız hicab da arvadlarımızı əxlaqsızlıqdan saxlıya bilməyəcəyinə bu vaqeə çox gözəl şahiddir. Bugünkü tərbiyəmizin nəticəsini özgə cür görmüş olsaydıq, biz onda təəccüb edərdik.

## XARİCİ XƏBƏRLƏR

**İstanbul** - Qaragüruh məhəlləsindəki vulkan birdən-birə açılıb ətrafa isti küllər və atəş yağdırmağa başladı. Lakin atəşin ən şiddətlisi sonradan genə öz məhəlləsindəki Qaragüruh camaatının başına tökülüb, biçarələri yaxıb külə çevirdi. Gecə vaxtı sağ tərəfdən əsən yel vulkanın atəşini sol tərəfdəki "Əhrar" məhəlləsinin üstünə də töküb, biçarələri pərişan elədi.

## İDARƏYƏ MƏKTUB

A Molla Nəsrəddin əmi! Bir dəfə mən Sibirə getmiş idim, mollalar da mənim arvadıma təlaq verib bir ayrı kişiyə vermişdilər. Sibirdən gəlib qaziyə ərizə verdim, mənim xeyrimə kəsdi. Tərəfi-müqabil məclisə şikayət verib işi mənim zərərimə kəsdirdilər. Mən narazı olub 1905-ci ildə mart ayının 19-cu günündə məclisə ərizə verdim. Məclisdə haman martın 30-da 64 nömrə ilə mənim ərizəmi idarəyə şeyxülislam atamıza göndərdi. İndi bilmirəm səbəb nə isə mənim ərizəm haman gündən qırmızı mahudun altına girib cavab gəlmir. Səni and verirəm Gəncə əllaflarının dəbbəsiz alış-verişlərinə və doğru-düz çəkilərinə ki, gedib ruhani atalarımızdan mənim ərizəmə olan binagüzarlığın xəbərini bilib öz məcmuəniz vasitəsilə mənə mə'lum edəsən. Vəssalam.

**Əztərəfi Kazım Məhəmməd oğlu**

**İdarədən: Bir kəllə qənd göndərsəniz, işinizi düzəldə bilərik.**

## POÇTA QUTUSU

Novoçerkezdə student Mirhəsən Vəzirov cənablarına: Əbdülhəmidin taxtdan düşməyi barəsində göndərdiyiniz təbriknaməni ləzzətnən oxuduq. Allah sizin də bayramınızı mübarək eləsin.

Axtıda Hacı Məcid oğluna: Yazırsınız ki, əfəndiniz Hacı Məhəmməd Şərif qoymur ki, camaat məktəb açsın. Əgər sizi yaxşı tanısaydıq - bu yolda bir az danışardıq, amma çünki tanımırıq - bu bir neçə sözə iktifa eləyin.

Petrovskdə "Yoldaş"a: Kağızınız o qədər məzəli idi ki, gülməkdən az qaldıq çatdıyaq. Bir də belə kağızlar yazmıyın, yoxsa birdən çatdıyıb ölərik.

Bakıda buzovnalı Əbdülrəsulun barəsində yazana: Elə xəbərləri (əgər doğru olsa) məcmuəmizdə yaza bilmənik.

Ordubadda Məşədi Mozalan bəyə: 18-ci nömrəyə qaldı.

Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə.

## E'LANLAR

**E'LAN**

"Söhbət basəri-rəfiqim və ya naleyi-qəribaneyi-Heyyir" açıq və şirin fars dilində yazılmış 63 səhifədən ibarət olan həmin kitab 25 bənd nəzm ilə vətənin halı yolunda nalə edir. Bu kitab "Qeyrət" mətbəəsində təzə çapdan çıxıb mövqeyi-intişara qoyuldu. Qiyməti 40 qəpik.

Xahiş edənlər bu adresə rücu' etsinlər: Tiflisdə, 6-cı hissədə, Botaniçeski küçədə, 9 nömrəli evdə, Şair Heyyir cənablarına, yainki "Molla Nəsrəddin" idarəsinə.

Həmin şairin "Mir'ati-vətən" adlı təzə çapdan çıxmış kitabı genə satılmaqdadır. Qiyməti 10 qəpik. Xahiş edənlər həmin adresə rücu' etsinlər.



**"Kitabül-bəyan"**

adlı təfsirimiz iki cilddə tamam oldu. Hədiyyəsi cildsiz 3 manat 50 qəpik, mücəllid 3 manat 90 qəpikdən 4 manat 50 qəpiyədək. Poçta xərci 80 qəpik.

Тифлисъ, Воронцовская ул., фабричный тупикъ д. N2.

Гаджи Ахундъ Мовла-заде.

**Tiflisdə çıxan "KAFKAZSKAYA ARMİYA"**

qəzetinin müdiri cənab B.S.Esadze təvəqqə edir davada yaralananlardan, şikəst və xəstə olanlardan, zəhmət çəkməyə imkanı olmuyanlardan və davada tələf olan və fövt olanların əyal və uşaqlarından - hər millətdən olsa, yuxarıda adı verilən qəzetə idarəsinə tezlikdə öz barələrində müfəssələn aşağıda yazılan mə'lumatı göndərsinlər: 1. Şikəst olanın familiyasını, adını və atasının adını, 2. onun mənsəbini və hansı polkda qulluq edirdi, 3. haralıdır və indi harada olur, 4. evlidirmi, subaydırmı və nə qədər uşağı var, 5. harada yaralanıb və şikəst olub (şəhadətnamə göndərməli), 6. hansı naqradları var, 7. hüsni-əxlaqı barəsində hökumətdən şəhadətnamə.

Bu mə'lumat ondan ötrü lazımdır ki, əvvəla, şikəstlərə ianə olsun və ikinci - onların uşaqları Tiflisin yanında açılan yetimxanaya götürülsünlər.

E'LAN

İki nəfər gimnaziya qurtaran urus qızları müsəlman evində qız və oğlan uşaqlarına tərbiyə və dərs vermək istəyir. Altıncı klasadək dərs verə bilərlər. Özgə şəhərə də getməyi qəbul eliyirlər. Xahiş edənlər "Molla Nəsrəddin" idarəsindən soruşsunlar.

## E'LAN

1. "Hesab məsələsi" (Задачник). Bu kitab məktəblərdə və evlərdə hesab tə'limi üçün tərtib olunub, 761 hesab məsələsini, 237 tə'limati-rəqəmiyyəyi və Rusiyada iste'mal olunan ölçüləri və ölçülərə dair tə'limləri havidir. Qiyməti 35 qəpikdir.

2. Gündəlik dərsləri yazmaq üçün yövmiyyə dəftəri (Дневник).

Şagirdlərə gündəlik, həftəlik, aylıq və illik nömrələr qoymaq və dərsləri yazmaq üçün cədvəlləri və bə'zi digər mə'lumatı havidir. Qiyməti 30 qəpik.

Bu kitabları almaq istəyən müəllimlərə və kitabçılara böyük təfavüt qoyulacaqdır. On ədəddən əskiyinə poçta markaları qəbul olunur. Xahiş edənlərə naloj ilə göndərilir.

**Adres: Gəncədə Həmidbəy Yusifbəyova.**

### İDARƏMİZDƏ SATILAN KITABLAR

| Kitabların adları | Yazanlar | Qiymətləri | |
|---|---|---|---|
| | | idarədə | poçta xərcilə |
| Dərs kitabları: | | | |
| Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dəsr kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dəsr kitabı | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: | | | |
| Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəi-tərəqqi (farsca) | -*--*--*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıb-zadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*--*--*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*--*--*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*--*--*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*--*--*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıb-zadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*--*--*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbəy Cavanşir (milli şe'r məcmuəsi) | -*--*--*- | 25 qəp. | 30 qəp. |

***Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik. Nalojnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.***

# "Молла Насрединъ"

КОНТОРА и РЕДАКЦИЯ
журнала
"Молла Насреддинъ"
Тифлисъ
Давидовская ул., д.24

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ И
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

ЦѢНА на ГОДЪ
Съ доставкою..............5 руб.
За границу....................6 руб.
ЦѢНА за ОБЪЯВЛЕНИЯ
За место занимаемое строкою
петита впереди текста ....10 коп.
позади " " " ....7 коп.




1.İstixarə vaxtında: dodaqlar tərpəşməsin.




2.Dua vaxtında: bir az dodaqlar tərpəşsin.




3.Nikah oxuyanda: lazımdır ağzı yan əymək.
Məsələn,Ənkühətü...




4.Mərsiyə oxuyanda: nə qədər mümkündür ağzı açmaq.




... Sultanlığım cəhənnəm! Bəs bu on bir arvadımdan
savayı qalan qırx doqquz arvadım necə olsun?..



Qardaş, tez ol, pulunu ver, get, molla gəlir (Şuşa şəhərində)




- Məşədi, qırqavuldan, kəklikdən varmı?
- Xeyr, axund, çoxdandır gətirmirlər.

**ABUNƏ QİYMƏTİ**
Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д. 24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**

**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**25 rəbiül-axər 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 3 may 1909**



## MƏNİMKİ BELƏ DÜŞDÜ

Qəm rahnümun oldu, mənimki
belə düşdü,
Dil vərteyi-xun oldu, mənimki
belə düşdü,
El döndü cünun oldu, mənimki
belə düşdü,
Tale mənə dun oldu, mənimki
belə düşdü,
"İqbal zəbun oldu, mənimki
belə düşdü".
Sən Məmdəli, qorxma!
Qəm çəkmə, darıxma!
Dövran özünündür...

Qafilmişəm əhvalıma
sövdayi-sərimdən,
Sövdayi-sərim etdi məni
taci-zərimdən,
Rişəm kəsilirmiş demə kəskin
təbərimdən,
Məşrutəyi salmaqda ikən
mən nəzərimdən,
Ol nurülüyun oldu, mənimki
belə düşdü.
"İqbal zəbun oldu, mənimki
belə düşdü".
Sən Məmdəli, qaçma!
Naəhlə əl açma!
Meydan özünündür...

Heç faidəbəxş olmadı
tədbirlərim, heyf,
Kəşf oldu bütün aləmə
təqsirlərim, heyf.
Bərəks əsər eylədi tə'birlərim, heyf,
Aldatmadı bu milləti
təzvirlərim, heyf,
Yulduzdakı... Yulduzdakı
tə'mirlərim, heyf,
"Həp kunfəyəkun oldu,
mənimki belə düşdü".
"İqbal zəbun oldu,
mənimki belə düşdü".
Sən Məmdəli, bərk dur!
Torbaları doldur!
Xırman özünündür...

Şeypur deyil, təbl deyil, sur çalındı,
Əks eylədi surun səsi, hər
qəlbə salındı,
Bir şəbdə otuz illik ümuratım alındı,
Osmanlıların şahı
vətəndən qovalandı,
İş döndü oyun oldu,
mənimki belə düşdü,
"İqbal zəbun oldu,
mənimki belə düşdü".
Sən Məmdəli, qorxma!
Qəm çəkmə, darıxma!
Tehran özünündür...

Sən vur işini, durma geri
məkrü hiylədən,
Mən topladığım şeyləri
həp qapdılar əldən,
Bunlar keçər, amma hələ
var qorxum əcəldən,
Sən qarnıyoğun bir şey idin
ruzi-əzəldən,
Boynun da yoğun oldu,
mənimki belə düşdü,
"İqbal zəbun oldu,
mənimki belə düşdü".
Sən nehrəni çalxa,
Heç baxma bu xalxa,
Ayran özünündür...







Etdim qəsəm, amma
özümü səhvdə sandım,
Kamil paşalar çidə
edən fikrə inandım,
Baxdım sənə öz əhdimi,
peymanımı dandım,
İllərcə, zamanlarca bu
gün dandığım andım,
Tarix qürun oldu,
mənimki belə düşdü,
"İqbal zəbun oldu,
mənimki belə düşdü".
Sən Məmdəli, qorxma!
Qəm çəkmə, darıxma!
Meydan özünündür...

Məzlumların tutdu məni
ahı axırda,
İncitdi xəyanətlərim allahı
axırda,
Oldum Salanik qəl'əsinə
rahi axırda,
Mənfalar ara türklərin
şahı axırda,
Məcburi-sükun oldu,
mənimki belə düşdü,
"İqbal zəbun oldu,
mənimki belə düşdü".
Qaç, Məmdəli, durma! -
Çox sinənə vurma!
Məndən götür ibrət! -
Sülh eylə, qudurma!
Vallah və billah, -
İnsansan inan, ah...
Fərman gedər əldən, -
Saman gedər əldən,
Yalnız nə ki Tehran, -
İran gedər əldən.

**Əbunəsr Şeybani**

## DÖRD YÜZ QIZ

Oxucularımıza ərz olsun ki, bu axır vaxtlarda əcnəbi mətbuatı və xüsusən Parijdə qəzetələr Əbdülhəmidin hərəmxanasını əldə bəhanə eliyib başlıyıblar nalayiq sözlər ilə biz müsəlmanların abrusuna toxunmağa. Abru varmı ya yoxmu - bu bir özgə məsələdir, amma söz burasındadır ki, aya, nə səbəbə onlar öz gözlərində qılı görmüyüb bizim gözümüzdə tiri görürlər?

Oxucularımızın izni ilə və millətpərəstlik vəzifəmi yerinə yetirmək qəsdi ilə mən də lazım bilirəm avropalılara necə ki lazımdır, cavab verəm. Elə cavab verəm ki, bir də haramzadalar cür'ət eliyib müsəlman adı çəkməsinlər.

Doğrudur və bunu inkar eləmək olmaz ki, Əbdülhəmidin altmış rə's arvadı var idi və bu arvadlarından savayı üç yüz qızdan ibarət olan hərəmxanası var idi. Övrətlərin ancaq on birini Əbdülhəmidə verib qalan övrətləri və qızları cavan türklər azad elədilər. "Tərəqqi" qəzetəsinin 87-ci nömrəsindəki teleqraf xəbərlərini oxuyanlar bilərlər ki, bu sözlər zarafat deyil.

Deməк, Əbdülhəmidin hərəmxanasında dörd yüzədək övrət və qız varmış.

Hələ mən istəyirəm biləm ki, bunun əcnəbilərə nə dəxli var?

Avropa millətlərinin Əbdülhəmidin hərəmxanasına sataşmağa heç bir haqqı yoxdur və buna mən bir neçə səbəb gətirə bilərəm.

Əvvəlinci səbəb:

Aya, məgər bu bir pis işdir? Nə səbəbə avropalılar öz əməllərini kənarda qoyub bizim yaxamızdan yapışıblar? Məgər Avropada belə hərəmxanalar yoxdur? London şəhərində elə mö'təbər fahişəxanalar var ki, orada nəinki dörd yüz, bəlkə dörd mindən artıq qız var. Moskva şəhərinin lap mərkəzində tamam küçənin imarətləri məhz belə işlərdən ötrü tikilib və axşam çırağı yanandan səhərə kimi faytonlar qıjhaqıj ilə işləməkdədirlər.

Avropada hansı bir şəhər var ki, orada Əbdülhəmid hərəmxanasına oxşuyan bir lotuxana olmasın?

Və bunlar keçəndən sora bizim öz sultanımızın hərəmlərinin qeyrətini çəkmək məgər avropalılara qalıb?

İkinci səbəb:

Bir saatlığa belə tutaq ki, Əbdülhəmidin hərəmxana işləri türkməyə layiq bir şeydir. Çox əcəb.

Bunun avropalılara nə zərəri? Məgər hərəmxanalara qatılan qızlar Avropa qızlarıdır? Dünya və aləm buna şahiddir ki, sultanın dörd yüz odalıqları Dağıstan çərkəslərinin, Qafqaz müsəlman gürcülərinin, Şamın ağ ərəb tayfalarının gözəl və balaca qızlarındandır ki, Əbdülhəmidin mə'murları fürsət düşən kimi xəlvətcə oradan-buradan şikar edib zor ilə aparıb qatıblar hərəmxanaya və burada genə bir elə pis iş yoxdur. Tutaq ki, şəriətdə heç bir müsəlman dörd nikahlı arvaddan artıq arvad ala bilməz, istər xəlifə olsun, istər çoban olsun. Amma genə bu bir çirkin iş deyil - əgər olsaydı, şeyxülislam şəriət naminə sultanın bu hərəkətinə e'tiraz edib mane olardı və saniyən, burada bir kəsə bir zülm də yoxdur. Doğrudur, qızları tutub aparanda bunlar əvvəl bir çığırbağır salırdılar, amma axırda xoşbəxt olurdular. Çünki bunların hansı sultana yaxın olmaq bəxtəvərliyinə çatırdısa qardaşları ya əmioğulları da saraya çağırılıb birdən paşalıq ya baş xəfiyyəlik mənsəbinə sahib olurdu. Məsələn, Əbdülhəmidin qayınları çərkəs Məhəmməd paşa, Cəlaləddin paşa belə ali məqama həmin bu vəsitə ilə çatıblar. Və hərçənd yerə-göyə sığışmıyan zülmlər camaata eliyiblər, amma eliyiblərsə də müsəlman camaatına eliyiblər, nəinki avropalılara. Dəxi özgələrə nə dəxli var?

Doğrudur, o cür ki Avropa qəzetələri müsəlmanların halını təsvir eliyirlər - adam oxuyanda ağlamağı gəlir. Müsəlman məmləkətlərində Əbdülhəmidin hərəmxanasına oxşuyan minlərcə hərəmxanalar var. Bu hərəmxanalarda minlərcə "xədim"lər var. Bu insan balalarını Afrika çöllərindən oğurluyub müctəhidlərin və şeyxülislamların gözlərinin qabağında qoyun kimi yerə yıxıb kişilikdən salıblar ki, hərəmlərə tamah eləməsinlər. Belə vəhşiliklər şəriətin ziddi ola-ola, heç bir "hamiyi-şəriət" bu yolda bir söz danışmıyıb.

Axırda cəmi islam dolub hərəmxana ilə. Cəmi müsəlmanlar "xədim" kimi bir şey olublar və "murdar" avropalılar bizim halımıza ağlıyanda, biz də onların üstünə gülürük.

Mərsiyəxanı görəndə ağlıyırıq.

Amma avropalını görəndə gülürük.

**Molla Nəsrəddin**

## ŞEYX

Bu Lənkəran həqiqətdə şeyx mə'dənidir.

Bu yavuq vaxtlarda Lənkərandan Qroznı şəhərinə bir şeyx gəlib.

Amma ağzımda şeyx deyirəm ha, özü də gündə bir arvad siğə eliyir.

Amma nə şeyx.

## ANA TƏRBİYƏSİ

Cənab Molla əmi! İndiyəcən biz elə bilirdik ki, bizim analarımız uşaqlarına heç zad öyrətmir və heç bir tərbiyə verə bilmirlər və hər məclisdə də eşidirik ki, müsəlman arvadları uşaqlarına tərbiyə vermir. Şükür allaha ki, indi bizim analarımız bu töhmətdən qurtardı. Daha biz özgə millətlərin yanında xəcalət çəkmənik. Şükür eliyirəm ki, mən bu gün ana tərbiyəsini öz gözümlə görüb bundan sora daha müsəlman arvadlarının barəsində heç bir söz deyə bilmərəm və indiyənə kimi nə qədər danışmışam, hamısından da tövbə eliyirəm. Bu daha aşkar olan işdir. Bakıda çox adam bilir və mən də bu gün öz gözümlə gördüm ki, bir nəfər müsəlman arvadı səkkiz yaşında balaca qızının əlindən tutub böyük rus kəlisasını o qıza göstərib ona nə dedisə, o qız da kəlisaya baş endirdi. Mən güman elədim ki, ibadətxana olduğu üçün qızına cəmi ibadətxanalara ehtiram eləməyi tə'lim verir, sora gördüm ki, qızının əlindən tutub kəlisanın divarından özü də öpdü və qızına da öpdürdü. Bu işə mənim təəccübüm bir az da artdı və kəlisanın həyətində duran ruslar da təəccüblə tamaşa edirdilər. Mən ayağımı saxlıyıb dayandım ki, görüm axırı nə olacaqdır. Gördüm ki, qızının əlindən tutub hər beş-on qədəmdə bir kəlisanın divarını öpə-öpə kəlisanı dolanırlar. Tamaşaçılar bir az da çoxaldı. Hamımız təəccüb qalmışıq, fikir eliyirik ki, burada böyük bir sirr olmalıdır. Daha nə başınızı ağrıdım, üç dəfə bu cür kəlisanı dolandırandan sora gördüm ki, kəlisanın içinə girmək istiyirlər, mən də irəli yeriyib baxdım gördüm qapının ağzında hər ikisi, ana və bala yıxılıb qapının astanasını öpdülər, sora durub içəri getdilər. Mən də və bir-iki nəfər müsəlmanlardan da içəri getdik. Kəlisanın içində bir dənə sağlam yer və bir dənə şamdan buraxmadılar. Hamısını və hər bir yeri qədəm-qədəm öpüb dolandılar, sora şamı alıb qıza verdi ki, şamdanlarda yandırsın. Kəlisadakı ruslar da bu işə təəccüb qalmışdılar. Axırda keşişin əlini öpmək istədilər, keşiş tamaşaçı müsəlmanların birisini çağırıb soruşdu ki, gör bu arvad nə deyir. Mən də bir az yaxına gedib gördüm ki, arvad deyir ki, keşiş ağadan razılıq edirəm, ondan ötrü ki, mənim qızımı bu kəlisa yaxşı elədi. Mən indiyənəcən o pir qalmadı, o məscid qalmadı, o molla, o seyid qalmadı ki, onlara nəzir eləmiyim. Nə qədər dualar yazdırdım, fala baxdırdım, mənim qızıma bir çarə olmadı. Neçə vaxt idi ki, naxoş olub yaxşı olmuyurdu, axırda allah tərəfindənmi oldu, ya qəlbimə düşdü, bu kəlisaya nəzir elədim. İndi qızım yaxşı olub, gətirmişəm ki, nəzirimizi yerinə yetirək. Mən kəlisadan çıxdım və öz-özümə yolda deyirdim ki, bizlərdə bu cür analar ola-ola biz genə deyə bilərikmi ki, analarımız uşaqlarına tərbiyə vermirlər? Genə allah bərəkət versin Bakıya. Mən belə bilirəm ki, bu cür analar genə ancaq Bakıdan çıxar, ondan ötrü ki, burada olan çoxlu üləmalar...

**(Mabə'di var)**

**Uzundanışan**

## UĞURSUZ

Bizim qonşumuz molla... dayının uğursuz bir qızı var. Bədbəxt qız o qədər uğursuzdur ki, hansı ərə gedir, beş ay çəkmir, əri ölür. Mə'lumdur ki, belə iş qızların özlərindən artıq ata və anasına əsər edəcəkdir. Bəli, bu iş onların günlərini qara edəcəkdir. Bizim mollanın qızı tamam dörd ərə getdi. Kimisi iki ayında, kimisi dörd ayında vəfat etdilər. Beş ay çəkən olmadı. Biçarə ata və anası Gəncədə bir molla və bir cindar qalmadı ki, gedib qızlarına dua yazdırıb, düyün dügdürməyələr. Çarə olmadı, olmadı ki, olmadı. Axırda bir gecə yuxuda bir nəfər nurani şəxs bunlara söylüyüb ki, hərgah istiyirsiniz qızınızın uğursuzluğu götürülsün, gərəkdir onu bir heyvana nikah edəsiniz. Əlac nədir? Biçarələr, boğulan çöpdən yapışan kimi, götürüb qızı bir öküzə nikah etdilər. Molla dayı, and olsun bizim Molla Abasəlinin ağıl və fərasətinə, indi düz doqquz ay tamam olubdur, amma öküz hələ sağdır. Deməl ki, nurani şəxsin sözü düz imiş. Sözüm burada deyildir. Qızın uğursuzluğu götürülməyinə götürülübdür. Çünki beş ayı keçdi. Sözüm orasındadır ki, biçarələr yağışdan çıxıb yağmura düşüblər. İndi də qızı öküzdən boşatmaq məsələsi ortaya gəlibdir. Dilbilməz heyvan çəkilib durub bir tərəfdə, qız da qalıb kəbin altında. Öküzün dili yoxdur ki, bir nəfər mollanı vəkil edə ki, o da qızın təlağını verə. Öz aramızda, deyəsən öküz də heç təlaq vermək istəmir.

İndi aman günüdür, Molla dayı, hərgah bir çarə var isə söylə. Biçarə qızı kəbin altında qoymaq olmaz. And olsun şeyx Əlinin ölümünə ki, bu sözlərdə bircə dənə də yalan yoxdur.

Xülasə, çarə! Çarə! Çarə!

**Əztərəfi-dostunuz**

**Yoncasatan**

## FELYETON

### MOZALAN BƏYİN SƏYAHƏTNAMƏSİ

Bir ay bundan qabaq gəlib çıxdım Ordubada.

And olsun allaha ki, buraya gəlməyimə çox şükür eliyirəm. Nə qədər ki yol zəhməti çəkib səyahət eləmişəm - hamısının acısı dəxi canımdan çıxdı. O qədər şadam ki, izhar eləməyə söz tapa bilmirəm. Allah cəmi oxucularımı mənim kimi xoşbəxt eləsin.

Şad olmağımın səbəbi budur.

.....................

Elm bir şirin şeydir və bəni-növ'i-bəşərin rahat yaşamağı elmin tərəqqisinə bağlıdır. Çiçək azarının müalicəsi tapılmasaydı, insan bir vaxt tələf olub qurtarardı. Min-min dərdlərə çarə tapılmasa adamın bütün ömrü ax-vay ilə keçər. Elektrik və buxar hikməti ixtira olmasaydı, avropaca rahat yaşamaq mümkün olmazdı. Budur ki, elmə və fənnə xidmət eləmək bir gözəl vəzifədir.

Ordubada gəlməkdə mənim üçün bir böyük qəlb təskinliyi vaqe olub. Burada yaşıyan məxluqatı ərbabi-elmin nəzərinə çəkmək ilə ümidvaram ki, "elmi-bəşər" yolunda etdiyim kəşfiyyat Avropanın etnoqrafiya dairələrində e'tinaya layiq bir əsər ola.

Əgər belə olsa, məndən xoşbəxt bu saat heç kəs deyil.

.....................

Əvvəla, buranın qəbiristanına "əhli-qübur" ziyarəti bəhanəsi ilə gedib ölülərin başlarının çanağından xəlvətcə bir neçəsini tapıb qoydum qutuya və keçən həftə poçta ilə göndərdim İngiltərənin Oksford darülfününuna. Amma qorxumdan pasılkanın üstündə yazdım "Ordubad qaxı" ki, hökumət mane olmasın. Darülfünuna əlahiddə kağız yazıb göndərdim və başların çanağını bir-bir tə'rif eləmişəm. Göndərdiyim dörd başın ikisi övrət və ikisi kişi başıdır. Başların zahiri təfavütləri budur ki, kişi başları böyük və övrət başları xırdadır. İkinci təfavüt budur ki, kişi başlarının çənəsi bir az qırmızı kimidir və bu da hənanın tə'sirindəndir. Üçüncü təfavüt budur ki, övrətlərin çanaqlarının yuxarısı batıq kimidir, bu da ərlərinin yumruğunun tə'sirindən olub. Bu tə'rifləri xüsusi kağızda ondan ötrü yazdım ki, darülfünunda çanaqları təşrih eliyəndə yazdıqlarımı nəzərə alsınlar.

Başları tə'rif elədiyim məktubda bunu da yazmışam ki, Darvin kitabının dördüncü fəslində və 127-ci səhifəsində kəşf etdiyi heyvanatın başlarının çanaqlarına mən göndərdiyim çanaqlar bilmərrə oxşamır. Bunu demək ilə mən ona işarə eləmirəm ki, Darvin kimi bir alim guya Ordubad məxluqatını nəzərə almıyıb ixtiraatında səhv eləmiş ola, xeyr, bu böyük cür'ətdir. Ancaq onu deyirəm ki, bəlkə Darvin Qafqaz tayfalarının üçüncü sinfini tə'rif edəndə Ordubad məxluqatını üçüncü sinifdən xaric edib özgə bir fəsil də yazacaqmış, yainki yazıb, mənim nəzərimə çatmayıb, çünki Vasilyevin tərcüməsində yoxdur.

## XÜLASƏ

İndi "Çanaq" məsələsindən bir az fariq olub ordubadlıların tələffüz məsələsinə məşğulam, çünki bura əhlinin danışıqlarına diqqət edib onu bilmişəm ki, bu barədə elm və fənn üçün ixtira olunmalı çox mətləblər var.

Həmin məktubumu bircə də bu söz ilə qurtarmaq istəyirəm ki, məşhur nemes tarixnəvisi Şlosserin kitablarında ad verilən tayfaların heç birinin cərgəsinə ordubadlıları daxil eliyə bilmirəm.

Bəlkə də səhvim var.

Amma bu işlər mənə yuxu kimi görsənir.

Sözün müxtəsəri, Xorasan kimi Yə'cucistanı görəndə genə o qədər təəccüb eləmədim ki, Ordubadı görüb edirəm.

Bari pərvərdigara, qüdrətini tə'rif etməyə acizəm.

(Mabə'di var)

**Məşədi Mozalan bəy**

## CAVAB

### QAZAXDAN

Molla əmi: Məcmuənizin 16-cı nömrəsində Hərdəmxəyal cənabları "sünni və şiə ittihadı tərəfdarlarına müjdə" ünvanlı məqaləsində yazır ki, "Qazax şəhərində şiələrin mədrəsəsindən üç sünni uşağını çıxardıb qovublar, o səbəbə ki üçünün adı Ömər imiş". Əgər doğrudan da, uşağın adı Ömər olmağı qovulmağa səbəb imişsə, o üç uşağın birinin adı Ömərdir, bəs iki uşaq ki birinin adı Əhməd Qaibzadə, o birinin də adı Cahangir Qəhrəmanzadədir, onların təqsiri nə imiş ki, qovulublar? Xeyr, əgər sünni olmaq cəhətinə qovublar isə, bəs indi məktəbdəki sünni uşaqları niyə qovulmur? Bundan aşkar olur ki, bu söz məhz iftira və açıq bir yalandır və təkrar ərz edirəm ki, bu sözlər şəxsi-bərqərəzdən, nəfsibərmənfəətdən törüyən sözlərdir ki, bə'zi müfsid və müfəttinlər istiyirlər ki, bu gunə vəsvəsələr ilə iki qardaş arasına ədavət salsınlar, necə ki məktəbdə oxuyan sünni uşaqların atalarını tovluyurlar ki, uşaqlarınızı çıxardın. Ancaq hiylələrinə iki nəfərdən qeyri aldanan olmadı və məktəbdə yarı sünni və yarı şiə uşaqları dərs oxuyurlar.

**Müəllim**
**M.Abdulla Həsənzadə**

## *BİNÖVRƏ DAŞI*

Şuşada bir əmmaməliyə yuxuda bir məntər öyrədiblər ki, onu bir daşa oxuyub təzə tikiləcək evin binövrəsi altına qoyanda, o ev çox möhkəm olur. Hətta əgər yeri belində saxlıyan qızıl öküz şıllaqlasa da o ev uçmaz. Və neçə gün bundan qabaq təzə tikiləcək bir ev var idi, haman əmmaməli gedib o məntəri daşa oxuyub binövrə altına qoydu. Allahtaala mübarək eləsin. İyirmi il təhsili-elm bəhanəsilə Kərbəlada qalıb əliboş qayıtmağın səmərəsi belə olar. Xülasə, o daşı posta ilə sair şəhərlərə də göndərmək olar. Hər kim istəsə ki, evi qiyamətə kimin uçmasın, əlbəttə, o məntərli daşdan birini aparıb binövrə altına qoydursun və özü də bu adresə rücu'eləsin: Şuşa, qeybdən şam yanan ev.

**Kəşkül**

## *POÇTA QUTUSU*

.....................

Petrovskdə "Cəlili"yə: İnanırıq, amma hələ qalsın.

.....................

Salyanda "Baxəbər"ə: Hacı Yunis Hacı Əbdülqəni oğlu camaata elədiyi zülmü təzə eşidirik. Bir özgələrindən də eşitsək yazarıq.

.....................

Gədəbəydə "Bir nəfər xalis müsəlman"a: Məşədi Cəlil sağ olsun ki, millət və maarif yolunda çalışır və bundan artıq bir kəsi tə'rif etməyə məcmuəmizdə yer yoxdur.

Müdir və baş mühərrik: Cəlil Məmmədquluzadə.

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə Varansovski - Vrangelski küçələrin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

Jurnalın hər bir nüsxəsinin qiyməti Ələkbərovun dükanında 12 qəpikdir. Əldə satanlarda 15 qəpikdir.

E'lan və abunə qəbul etmək üçün vəkilimiz haman Məşədi Əyyub Ələkbərovdur.

# “Молла Насрединъ”

КОНТОРА и РЕДАКЦИЯ
журнала
“Молла Насреддинъ”
Тифлисъ
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

ЦѢНА на ГОДЪ
Съ доставкою..............5 руб.
За границу....................6 руб.
ЦѢНА за ОБЪЯВЛЕНИЯ
За место занимаемое строкою
Петита впереди текста .....10 коп.
позади * * * .....7 коп.




Möhlət ilə verilir
Bir manatadək
Bir manatadək
Əl maşınları - 25 manatlıqdan başlamış
Rusiyada məhz öz mağazalarımızda satılır.
Tiflisdə üç məxsusi şö'bə var:
1. Qalovinski küçədə, Mirimanovun evində, Sərdar imarətinin qabağında.
2. Vağzal küçəsində, İnficiyansın evində.
3. Avlabarda, Kaxetinski küçədə, Həsən Calalovun evində.
Hökumət tərəfindən təsdiq olunmuş mağaza lövhəsi
Fabrika əlaməti
Saxtalarından ehtiyat edin.






1897



1908




1888

“PRAVODNİK” şirkətinin

*Tiflis, Salolak küçəsində, nömrə 4.*
*Тифлисъ, Сололакская ул. № 4.*

Zaqafqaziyada fabrika anbarı
Tə'mirat mövsümü münasibəti ilə

## Проводникъ-Линолеумъ

Pravodnik-linoleumu
alıb otaqların fərşinə döşəməyi məsləhət görürük.

Linoleum olan yerdə dəxi parket, polların rənglənməyi, nəqşi, fərşi, qalı-qalça, kənarə, müşənbə və qeyr şey lazım deyil. Hər qisim fərşə döşənən şeylərdən linoleum o barədə yaxşıdır ki, cövhəriyyatın tə'sirindən xarab olmur, yeriyəndə səslənmir, asan təmizlənir və həmişə gözəldir.

Özü ucuz ola-ola linoleum
möhkəmlikdə, asanlıqda və göyçəklikdə indiyədək şöhrət tapan cəmi otaq fərşlərinin cümləsindən birinci yer tutur.
Buna da şahiddirlər haman töhfələr və təsdiqnamələr ki,
“Pravodnik” şirkətinə rus və əcnəbi sərgi-
(выставка) lərində verilibdir.

Linoleumun nəqşləri və hesabı tələb olunan kimi göndərilir.




... Əgər Yaponiyada arvadlar üzüaçıq kişilər ilə bir
yerdə işləməyə adət eləməsəydilər - o və"də yaponiyalılar da müsəlmanlar kimi tərəqqiyə çatardılar
(Molla Əbdülrəşid İbrahimov).




Culfada İran tacirləri və Araza tökülən İran məzlumları

# ملانصرالدين

№19. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپک ۱۹





Литог. С. Быхова

Ənvər bəy. Ən əvvəl saraya girib Sultan Həmidi taxtdan yendirən Osmanlı mücahidi




Ruhani məclisində molla imtahanı

Роттеръ.

Vallah, mən bir toyuğa şəhadətnaməyə qol çəkə bilmənəm.

Ничтъ, ничтъ, да одну курицу я не подпишу аттестата

**ABUNƏ QİYMƏTİ**
Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д. 24.*

Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

E'lan qiymәti

Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

**3 cəmadiyəl-əvvəl 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 10 may 1909**



## ƏDƏBİYYAT

Ay yazıq iranlılar, allanmayın!
Hər sözə, hər və'dəyə
tovlanmayın!

Tez elə tovlanmayınız
hər sözə,
Bir tələdir bəlkə qurullar sizə.
Çıxmasa asari-sədaqət yüzə,
Hər sözə, hər və'dəyə
tovlanmayın!
Atəşi-zülmə yaxılıb yanmayın!

Dam üzərində görərək danəni,
Verməyin əldən dili-divanəni.
Yada salıb məclisi-viranəni,
Aqibətəndiş olun, allanmayın!
Ay yazıq iranlılar, odlanmayın!

Görmədinizmi hələ
Tehranı da?
Məclisi-millidə axan qanı da?
Parçalanan ayeyi-Qur'anı da?
Bir daha icmaə
qığıldanmayın!
Ay yazıq iranlılar, allanmayın!

Ey vətən övladı, nədir bu
şitab?
Bu nə kəşakəşdi, bu nə
inqilab?
Ax, nə parlaman, nə hesabü
kitab?
Ədlü ədalət deyə odlanmayın!
Ay yazıq iranlılar, allanmayın!

Ey vükəla, sizdə nədir
bu həvəs?
Ölməyə amadəsiniz hər nəfəs.
Qorxuram axır sizə olsun
qəfəs.

Gülşəni-Tehranə
qanatlanmayın!
Dərdü qəmi-millətə
qatlanmayın!
Ay yazıq iranlılar, allanmayın!..

**Keyfsiz**

## İSTİFTA

Bakı qəzetələri həzarəti-üləmadan soruşurlar ki, hal-hazırda Bakıdakı Kür suyuna camaatın ehtiyacları var, aya, bu su pakdırmı ki, camaat içə bilsin, yainki yox?

Bu istiftaya belə cavab verilib: "Mövzuatı təşxis və tə'yin etməkdə üləmaya ehtiyac yoxdur, avamlar da təşxis edə bilərlər, məəzalik... suyun üstündə açıq yer var, bilfərz mütənəccis olubsa da yağış vasitəsi ilə qət'ən və yəqinən pak olub heç bir şəkk-şübhə yeri yoxdur. Hər kəs istəsə gedib təhqiq edə bilər".

İstiftaya imza qoyublar bir molla və bir hacı.

Bəli, mövzuatı təşxis və tə'yin etməkdə üləmaya ehtiyac yoxdur.







Avamlar da təşxis edə bilərlər, amma mən ona heyfsilənirəm ki, bu sözlər ərəbcə yazılıb və camaat qanmıyacaq. Yaxşı olardı ki, bu cavab avamın öz dilində yazılaydı, məsələn, bu cür ki, ay allahın heyvanları, görürsünüz ki, Kür suyunu üç yüz min Bakı camaatı içə-içə kökəlir, görürsünüz ki, Kür suyunun dadı nə acıdır, nə şordur, nə turşdur, nə qoxusu var, nə lildir, ay dilsiz-ağılsız, adama oxşuyanlar, dəxi üləmaya niyə başağrısı verirsiniz?

Amma öz aramızdır, - üləmamızın cavabında da mən o qədər sədaqət görmürəm. Səbəbi budur ki, həqiqətdə əgər mövzuatı təşxis etməkdə üləmaya ehtiyac olmasa, dəxi bundan sora kim üləmaya hörmət qoyacaq, dəxi bundan sora üləma kimə lazım olacaq? Bizim mübarək müsəlmanlar üləmadan izin almamış, üləmadan istifta eləməmiş bozbaşa noxud salmaq istəmirlər. Əgər mövzuatı tə'yin eləmək məşədilərin öz ixtiyarına qalsa, dəxi üləmanın üzünə baxan kim olacaq? Və buna da inana bilmirəm ki, üləmamız öz xoşlarına mövzuatın təşxisindən özlərini kənar eliyələr - xeyr, hələ çətindir, hələ tezdir. Bəlkə bir vaxt elm və fənnin bərəkətindən bu işlər düzələ. Əgər mövzuatın təşxisini üləmamız camaatın öz ixtiyarına qoymaq istəsəydilər, yuxarıdakı istiftanın cavabını iki sətir ilə qurtarıb deyərdilər ki, bu bizim işimiz deyil. Amma, xeyr, genə noxtanı əldən ötürmək istəmiyiblər: "Bəli, getdik suya baxdıq, suyun üstü açıqdır və nəcis olsa da yağış təmizləyir. Bəli, biz izin veririk ki, içəsiniz".

Yox, əzizim, belə deyil. Mövzuatı hər bir avam təşxis edə bilməz və onunçün də avamdır ki, heç bir şey təşxis edə bilmir.

Xüsusən su məsələsində ki nəinki avamların, bəlkə üləmamızın da bu məsələni təşxis və tə'yin etməyə ixtiyarı yoxdur.

Su nədir? Nə əczadan əmələ gəlir, nə səbəbə su qaynayanda buğ olur, niyə donanda bərkiyir, mə'dən suları hansıdır, dərya suyu nədir, axar suyun xasiyyəti nədir, kəhriz suyunun hikməti nədir, yağış suyu nədir, niyə bir para m'dən sularını bir para xəstələrə və bir para mə'dən sularını bir özgə qisim xəstələrə rəva görürlər, nə vaxt çiy suyu lazımdır içmək, nə vaxt qaynatmaq lazımdır, dünyada ən yaxşı sular hansı çayların, mə'dənlərin, yaylaqların suyudur, Qafqazda hansı sular var, suyu nə cür təmizləmək?

Yoxsa bunlar zarafatdır? Bəlkə bunların hamısını üləmamız bilir? Əgər bilirlərsə zəhmət çəkib buyursunlar görək hansı darülfünunda və nə kitablar ilə təhsil eliyiblər? Əgər bilmirlərsə bəs yazıq camaatın yaxasından niyə əl götürmürlər?

Sözün doğrusu, su məsələsinin istiftası mənim xoşuma gəldi. İndiyədək molla mə'sumlar və mirmurtəzalar ancaq ruslar ilə əl-ələ verməkməsələlərindən yana istifta edirdilər, amma su söhbəti çox əhəmiyyətli və danışılmalı mətləbdir.

Doğru deyir Bakı camaatı: Aya, Kür suyunu içmək olarmı, ya yox? Hərçənd bu istiftadan məqsəd behişt açarını piş əz-vəqt ələ gətirməkdir, amma genə su məsələsinin heç olmasa diriliyə də dəxli var.

Bəli, içmək olar, ondan ötrü ki, üstü açıqdır və yağış vurub təmizləyir. Vəssalam.

Yox, sərkari-mən, hər suyu içmək olmaz, istər həmişə yağış vursun. Hindistanda Qanq çayı bizim Kür çayından çox böyükdür və həmişə yağışın altındadır. Amma bu sudan vəba zəhəri heç əskik olmur və həmin azarın mə'dəni Qanq çayı hesab olunur. Bir çayın başı azarlı vilayətlərdən axıb gələndə çayın aşağılarında düşən əhaliyə o suyu içməyi həkimlər qadağan eliyirlər. Amma dünyada elə sular da var ki, insanı ölümdən qurtarır, məsələn Qafqaz mə'dən suları, Avropada Karlsbad suyu və qeyr min-min sular.

Yuxarıda yazdığımız su istiftası mən indiyədək bu üç ilin müddətində dediyim sözlərin hamısını təsdiq eliyir və mən indi genə deyirəm ki, işlər asanlıq ilə düzəlmiyəcəkdir.

Noxudu bozbaşa salanda aşpazı qoyub, axund ilə məsləhət eləyirik.

Yüz min camaat içdiyi suyun yaxşılığını və pisliyini təbib əvəzinə molladan və hacıdan soruşur. Əgər bu gördüklərimizi on il bundan qabaq görsəydik - genə bəlkə təəccüb eləməzdik. İndi dünyavü aləm bir-birinə dəyir.

Və biz genə hələ nələr görürük.

**Molla Nəsrəddin**

## *E'LAN*

İranlı qardaşlarıma e'lan edirəm: Hər kəsin biri-birindən haqq-hesabı ola, lazım görmürəm ki, konsulxanaya, polisaya və suda şikayət etsin. Hər gün saat ondan on dördə kimi öz dərzi dükanımda işə baxıram, haqq, zəhmət də yarım girvəngə qənd və iki misqal çaydır.

Adres: Sabunçuda öz dərzi dükanımda.

## *QƏRİBƏDƏN DƏ QƏRİBƏ*

Molla dayı! Burasını mən bilirəm ki, dünyada sən çox qəribə işlər və qəribə adamlar görübsən. Amma qəribədən də qəribə iş görmüş də olsan çox az görübsən. Ona görə qulaq ver, sənə bir əhvalat söylüyüm. Dünyada pulunun qədrini bilən çoxdur. Amma hər nə qədər pulunun qədrini artıq bilsə, genə də kor şeytan onu ömründə beş-on dəfə tovluyub, məktəb və camaat üçün azdan-çoxdan bir şey məsrəf edəcəkdir. Şeytan tovlamasa da elə yeri düşəcəkdir ki, utanıb-qızarıb, belə şeytan karxanasına beş-on şahı verəcəkdir. Bu qəribə deyildir. Qəribə də olsa artıq bir qəribə deyildir. Amma qəribədən də qəribəsi odur ki, ömrünün əvvəlindən axırına kimi bir dəfə nə şeytan sənə yaxın dura bilsin və nə də camaat utandırıb qızartsın. Hə, deyəcəksən ki, be-

lə şey ola bilməz! Yox, vallah, var. Hərgah elə deyildir, bəs niyə Gəncənin bəyləri, axundları, cavanları üç gün çalışıb Şeyx Nizaminin künbədinin tikilməyinə bir nəfər mahal qazisindən on şahı ala bilmədilər. Hərgah elə deyildir, bəs özü niyə deyirdi ki, mən ömrümdə belə şeylərə pul verməmişəm və bundan sora da verməyəcəyəm. İndi bildinmi? Di yaz, qoy başqa camaat da bu qəribədən də qəribəni bilsinlər. Amma mən belə qanıram ki, bunun hamısı Şəki pirlərinin tə'sirindəndir.

**Əztərəfi - dostunuz Yoncasatan**

## E'LAN

Bu günlərdə təzə təhsildən gəlib Şahtaxtı əhlinə xəbər verirəm ki, yaxşı köbək duası, məhəbbət duası və bağlı adamları açmaq duası yazıram, sancı və diş ağrısını da müalicə edə bilərəm.

Viziti 25 qəpikdir.

Adresim; Şahtaxtında Məşədi Kərimin çayxanasında.

## ŞEYTAN

Aprelin 24-də cümə günü şeytani-məl'unu Gəncədə bir neçə yerdə görübdürlər ki, oğlu Xənnas ilə bərabər gəzirlər. Deməyə görə şeytan haramzadə Avropa libasında imiş. Hətta yaxasına qraxmal da taxıbmış. Rəvayətə görə həmin gündə Gəncədə oynanılası... teatronun oynanmamağına bais bir məl'un olubdur. Şeytanın öz yaxın dostlarından birinin deməyinə görə şeytan özü bir tərəfdən, oğlu Xənnas da bir tərəfdən şəhərə düşüb xalqa vəsvəsə edib teatroya gəlməklərinə mane olubdurlar. Şeytanı o günü neçə yerdə görübdürlər. Cümləsindən Şah Abbas məscidində də görübdürlər ki, orada bir nəfər mollanı tutub muştuluq istəyirmiş ki, o, yə'ni şeytan qoymuyubdur teatroya heç kəs getsin ki, o xilafi-şəriət olan əməl baş tutsun. Şeytanı görənlər nağıl edirlər ki, bir balaca alçaq şələli adam kimi bir zad imiş, iki balaca buynuzu və nazik bir dənə quyruğu varmış.

Allah sənə lə'nət eləsin, kor şeytan!

**İmza: Firiştə**

## TARİXİ SUALLAR

"Zübdətüt-təvarix" kitabının 6-cı səhifəsindən eynilə:"Cəmi görülən və görülməyən şeyləri allah-taala altı gündə xəlq elədi; əvvəli yekşənbə günü və axırı cümə günü idi. Yekşənbə günü - göyləri və yerləri və düşənbə günü - ayı və ulduzları və səşənbə günü - aləmin canavarlarını və quşlarını və səhrayi və dəryayiheyvanları xəlq elədi və çaharşənbə günü - suları və dəryaları və çayları və böyük nəhrləri xəlq edib yer üzündə cari elədi, ağacları və otları göyərtdi, pəncşənbə günü dünya həmin tövr mövcud idi və qüsuru yoxdu".

**MOLLA NƏSRƏDDİN**

Bir para ədib və mühərrirlərimizin vaxtı ilə mədh elədikləri "Zübdətüt-təvarix" kitabını hərdənbir biz də oxuyub feyz alırıq. Amma, heyf ki, bə'zi yerlərini başa düşə bilmirik. Bu səbəbə görə aşağıdakı sualları kitabın müəllifi cənab Şeyx Hacı Həsən Mollazadə Gəncəvidən soruşuruq ki, öyrənib feyzyab olaq:

1 - Ay və ulduzlardan əvvəl yaradılan göy və yerlər nə ilə işıqlanırdı?

2 - Dərya və çaylardan əvvəl yaradılan dərya və çay heyvanları harada olurlardı?

3 - Ağac və göy otdan əvvəl yaradılan quşlar nə ilə yaşayırlardı?

4 - Pəncşənbə günü behişt və hurilər xəlq olundu. Yaxşı, bəs qılmanlar harda qaldı və nə vaxt xəlq olundular?

5 - Cümə günü nə oldu?

**Nadinc**

## EHSAN

Molla əmi! İki il bundan qabaq biz dörd nəfər müsəlman Bakıda Hüseynqulu məscidinin həyətini böyütmək üçün istədik ki, bir ehsan edək. Məscidin yanında bir nəfər müsəlman evini iki yüz manata ucuz qiymətə danışdıq və adama əlli manat yığıb məscidimizin ruhanisi bir axunda verdik ki, yay fəslində ev sahibi bağa gedəndə evi boşaldıb məscidə təslim etsin və iki yüz manatı da axunddan alsın. O şəxs şərtimizə görə evi boşaldıb gəlib axunddan pulu istiyib, axund pulu vermiyib. Xülasə, bu biçarə iki il get-gəldən sonra ümidini kəsib evini təzədən tikdirib özü əyləşibdir. İndi biz gedib axunddan pulumuzu geri almaq istiyirik, axund pulumuzu özümüzə də vermiyir.

Amma axund əli təsbehli, saqqalı hənalı, batman çərək əmmaməli, ayağı qışda da nəleyinli,

dalında hədsiz-hesabsız müridi, müqəddəs bir adamdır. Mollá əmi! İndi sizdən bu məsələni soruşuruq. Biz dörd nəfər dəmirçi o pulları od qabağında yana-yana, əllərimiz qabar ola-ola qazanmışıq.

İndi əgər o pulları axundun özü yeyib bizə verməsə ehsanımız genə qəbula keçərmi? Yoxsa ki, pulumuz boş yerə gedəcəksə bizə bir yer göstərəsiniz ki, gedib axunddan pulumuzu girov ala bilək. Yoxsa əgər bilsək ki, ehsanımız qəbul olunacaq - onda heç pulu da istəmənik...

**Dörd dəmirçi**

## *DOLU DUASI*

Dolunun yağmaq vaxtına az qalıbdır. Ona görə məcmu bağ və əkin sahiblərinə e'lan edirəm ki, Şuşada bir yaxşı əmmaməli molla vardır. Və füqəraya göndərilən ianə şamlarını da anbarda çox möhkəm saxlıyır. Gör necə yaxşı adamdır ki, Şeyxülislam uzun bir kağız´ yazıb ondan bir cüt corab istəmişdir. Xülasə, bu əmmaməli yaxşı dolu duası yazır. Hər kim onu dörd parça kağıza yazdırıb hər birini, məsələn, bağçanın bir guşəsində basdırsa ona bircə dənə də olsa dolu düşməz və özü də pul-zad istəmir, ancaq duanı bu şərt ilə yazıb verir ki, hər vaxt mövqufat hesabı xudanəkərdə doqquzca min manat dolaşığa düşsə, dua yazdıranlar yığışıb hesabı düzəldib qəzetələrə göndərsinlər.

**Kəşkül**

## *İSALARIMIZ*

Qafqazımızın üsuli-cədidə məktəbləri-allahın iznilə-qəribə isalar yetişdirir. Kül Avropanın başına ki, Həzrət İsaya sahib olaola, ibtidai məktəblərində indiyə qədər bir İsa da yetişdirə bilmədilər. Genə həmd olsun bizim Qafqazdakı müsəlmanlara ki, əski tarixlərin, əski mö'cüzələrin qədr-qiymətini itirmirlər.

Budur ki, Qafqazımızın hansı bir yerində üsuli- cədidə məktəbi açılsa, bir-iki ay içində orada oxuyan uşaqların dilləri də bülbül kimi açılır. Az vaxt içində uşaqlara qeybdən elə bir zəkavət və şüur gəlir ki, insan məəttəl qalır.

Həzrət İsanın beşikdə danışmağına biz təəccüb edirik. Amma gəl gör ki, bizim üsuli-cədidələr az vaxt içində necə isalar yetişdirir! Beş-altı yaşında uşaqlar yüzlərcə camaatın qarşısında necə fəsihanə, bəliğanə nitqlər danışırlar. Avropanın mədəniyyətindən, Amerikanın tərəqqisindən, Yaponiyanın qeyrətindən necə qəribə hallar nağıl edirlər.

Hələ bunlar nədir, elə qəribə ibarələr, ayətlər deyib, elə alimanə təfsir edirlər ki, insanın ağlı çaşır, gözünün yaşı sel kimi axır.

Allaha min-min şükürlər eliyirəm ki, nə yaxşı bizim də milli qəzetələrimiz varmış! Yoxsa olmasaydılar, bu ruhül-qüdsləri və onların mö'cüzanə nitqlərini haradan eşibid feyz ala bilərdik?

Bunlarla belə, genə də deyirlər uşaqlarımız oxumur.

**Hərdəmxəyal**

## *TELEQRAF XƏBƏRLƏRİ*

....................

**Kazan** - Tatar qəzetələrinin mühərrirləri qərar qoydular ki, yazdıqları hər sətrin içində heç olmasa bir rus sözü bulunsun ki, müsəlman sözləri dava eləməsinlər.

....................

**Səmərqənd** - Buranın müftisi böyük bir qız məktəbi açmaq fikrindədir.

....................

**Səlanik** - Kərbəlayı Həmid gecə saat ikidə yuxusunda dondurma gördü və ayılıb istədi. Lakin rədd cavabı alınca Ulduzda olmadığını qanıb dərdindən yuxusu qaçdı.

....................

**Şəki** - Dabbağxanada açılan qız məktəbinə Nurməhəmməd əfəndi fəxri nazir tə'yin olundu.

....................

**Orenburq** - Birinci məhəllənin mədrəsələri elmi-lədünnü oxuyub "Vasülül-allah" olanlara məxsus olduğundan şəhər idarəsindən verilən beş yüz manatı kafir malı deyib rədd etdilər.

....................

**Bakı** - Cəmiyyəti - xeyriyyənin açacağı mükəmməl darülmüəlliminin planı hazırlanır. Bakı- Müsəlman qəzetələrinin soruşmağına görə hacı cavab verdi ki, Bakı camaatı Kür suyunu içə bilər.

**Şuşa**- Məşhur qanalan Məşədi Huri nənə arvadlara e'lan edib ki, yuxuda görmüşəm bir aydan sora mənim armud ağacımın dibindən ocaq çıxacaq.

**Ordubad** - Təbriz yolu açılmaq münasibətilə hənə karvanının da ağzı açıldı, qırmızısaqqallar tərəfindən böyük bir cəşn bərpa olundu.

**Məşədi Mozalan bəy**

## POÇTA QUTUSU

Ağdamda Naib Qulu xan barəsində məktub göndərənə: Nahaq yerə zəhmət çəkibsiniz.

Nuxada Əbdülhəmidin barəsində idarəmizə "Hacı İbrahim Xəlil" imzası ilə məktub göndərənə: Məcmuəmizdə çap olunmağa məktubunuzun ləyaqəti yoxdur.

Zaqatalada Abbasquluya: Şeyxlərin əməllərini, doğrusu, adam yazmağa da utanır.

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

Badkubədə Mehmanxaneyi - "İslamiyyə"
Гостинница "ИСЛАМИЯ" въ гор. БАКУ.
Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasroptsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar. Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".
Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.
Баку, Губернская ул., номера "ИСЛАМИЯ", телефон 1251.

Gəncə şəhərində Bulatovskaya caddədə Mehmanxaneyi-"İslamiyyə"

Yaxşı, təmiz və pak nömrələr, hər cür Avropa və Asiya təamları. Hər kəs öz istirahətini sevərsə bir dəfə gəlib görməsini təvəqqə eliyirik. Mehmanxanamıza təşrif gətirən möhtərəm müsafirlər xoşhallıq və razılıq ilə qayıtmaqdadırlar.
"İslamiyyə" mehmanxanasının sahibləri: Məşədi Tağı və Məşədi Qurban.

Təzə açılan
"KAFE LONDON"
Qalovinski küçədə, Mantaşevin evində, nömrə 6.
Obşestvennoye sobraniyanın altında Məhz Lakedrə və kompaniyasının mə'dən və meyvə suları (limonadları),

həmçinin qəhvə, çay, şokolad, kakao, süd, qatıq, morojni, hər cür pivə, soyuq zakuskalar, isti pirajkilər və qurabiyələr.
Təmizlik və səliqə intəha mərtəbədədir. Fəvvarəli bağçası. Ehtiram ilə Niparidze və kompaniyası.

## E'L A N

E'lan edirəm ki, meyvələri alıb satmaq üçün may ayının birindən Pyatiqorsk şəhərində komisyonnu kantora açmışam. Komissiya ilə hər qisim meyvə və yemişləri alıb satıram, qabların sınıb xarab olmağına cavab verirəm. Meyvə sahibi beş illik müddətinə kimi hesab kitablarını təhqiq eləməyə muxtardır. Bağ sahibləri, icarədarları və meyvə komisyonçuları işlərimdən baxəbər olub e'tibar edə bilərlər.

Adres: Pyatiqorsk şəhərində, Terski oblastda, Məşədi Həsənqulu Ələsgər oğlu Qurbanov.

г. Пятигорскъ (Терской области). Машади Гасанъ Алескеръ оглы КУРБАНОВЪ.

Teleqram üçün :Пятигорскъ КУРБАНОВЪ

**ЕВРОПЕЙСКИЙ и АЗИАТСКИЙ ПОРТНОЙ**

**Исмаилъ Гаджи Мамедъ оглы**

**ГАДЖИЕВЪ**

Hər cür Asiya və Avropa libaslarını tikməyi qəbul edirik və ucuz qiymətə alıb səliqəli iş görmək ilə həmişə müştəriləri razı yola salırıq. Sifariş sahibləri aşağıdakı adresə rücu'etsinlər: Tiflis, Qanovski küçədə, nömrə 4. İsmayıl Hacı Məhəmməd oğlu Hacıyev.
Тифлисъ, Гановская ул. N-4.

**Tiflisdə çıxan "KAFKAZSKAYA ARMİYA"**

qəzetinin müdiri cənab B.S.İsadze təvəqqə edir davada yaralananlardan, şikəst və xəstə olanlardan, zəhmət çəkməyə imkanı olmuyanlardan və davada tələf olan və fövt olanların ə'yal və uşaqlarından - hər millətdən olsa, yuxarıda adı verilən qəzetə idarəsinə tezlikdə öz barələrində müfəssələn aşağıda yazılan mə'lumatı göndərsinlər: 1. Şikəst olanın familiyasını, adını və atasının adını, 2. onun mənsəbini və hansı polkda qulluq edirdi, 3. haralıdır və indi harada olur, 4. evlidirmi, subaydırmı və nə qədər uşağı var, 5. harada yaralanıb və şikəst olub (şəhadətnamə göndərməli), 6. hansı naqradları var, 7. hüsni-əxlaqı barəsində hökumətdən şəhadətnamə.
Bu mə'lumat ondan ötrü lazımdır ki, əvvəla, şikəstlərə ianə olsun və ikinci - onların uşaqları Tiflisin yanında açılan yetimxanaya götürülsünlər.

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə Varansovski-Vrangelski küçələrin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.
Jurnalın hər bir nüsxəsinin qiyməti Ələkbərovun dükanında 12 qəpikdir, əldə satanlarda 15 qəpikdir.
E'lan və abunə qəbul etmək üçün vəkilimiz həmin Məşədi Əyyub Ələkbərovdur.

## E'LAN

Kitabxanamızda hər cür məktəbə və maarifə dair kitablar mövcuddur. Kitab Təşrihəl-fəraiz, Risaleyi-zübdətül-əhkam, Ümdətül-əhkam, Əcəm dili, Uşaq bağçası, Nəsihətül-ətfal, Tərcümeyi-töhfeyi-Nəsuhiyyə və Təfsirəl-Qur'an əsəri-Mollazadə və Təbrizin xəritəsi 60 qəpiyə və kitab Tacültəvarixi İraniyan Hacı Ələsgər Məhəmmədzadə-kitabfüruş dükanında satılır.

IV ГОДЪ ИЗДАНИЯ № 19 МАЯ 10-го 1909г.

# "Молла Насреддинъ"

КОНТОРА и РЕДАКЦІЯ
журнала
"Молла Насреддинъ"
Тифлисъ
Давидовская ул., д.24

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

ЦѢНА на ГОДЪ
Съ доставкою..............5 руб.
За границу....................6 руб.
ЦѢНА за ОБЪЯВЛЕНІЯ
За место занимаемое строкою
петита впереди текста .....10 коп.
позади * * * .....7 коп.



İndiki vaxtda



Bir az əvvəllərdə

İndiki vaxtda




Məşədi, tək səbir gəldi, indi getmiyək, qalaq sabaha

# ملا نصر الدين

№20. Цѣна 12 к. **МОЛЛА НАСРЕДДИНЪ** قیمتی ۱۲ قپک ۲۰




Müsəlman qardaşlar, vallah mən sizi çox sevirəm,
ancaq mənim düşmənçiliyim Dumadakı oxumuş cavan vəkillərinizlədir...

Литог. С. Быхова




Bu zibili belə təmizləməli ki, küncdə-bucaqda qoxub
gözəl havamızı üfunətləndirməsin.

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д. 24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**

**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**10 cəmadiyəl-əvvəl 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 17 may 1909**



## ƏDƏBİYYAT

Va...h! Bu imiş dərsi-üsuli-
cədid?
Yo...x! Yo...x! Oğul, məktəbi-
üsyandı bu.
Molla deyil bundakı tə'lim
edən,
Əlhəzər et, bir yeni
şeytandı bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu...

Gör necə alt-üst eliyib şeyləri,
Döndərib "a", "ba"yə
əlif-beyləri,
Bid'ətə bax! "ya"
oxudur "yey"ləri,
Sanki hürufat ilə düşməndi bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu...

Diqqət edib baxsan əgər
dərsinə,
Hər sözü tə'lim eliyir tərsinə,
Dəyməz o bir paslı dəmir
ərsinə,
Min də desə dürci-
zərəfşandı bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu...

Verdiyi dərsi uşağa yazdırır,
Hüccə demir, hər əməlin
azdırır,
Gah oxudur, gah çıxarıb
gəzdirir,
Bir demir övladi-
müsəlmandı bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu...

Bir də görürsən ki, olub
heyvərə,
Əlli uşaq banladı birdən-birə,
Dərs demə! Gülməli bir
məsxərə,
Molla demə!
Məsxərəcünbandı bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu.

Düz yeri bir yupyumuru
şey qanır,
Həm də deyir: Sutkada
bir fırlanır,
Ay dolanır, göy dayanır,
gün yanır,
Kafirə bax! Gör nə
bədimandı bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu...

Bundan əzəl böylə deyildi
səyaq,







Dərs oxudan mollada vardı
ləyaq,
Molla qoyardı başına
şiş papaq,
Öylə ki, bir fazili-dövrandı bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu...

İndi bütün iş dolanıb lağlağa,
Dərs oxudur hər başı
fəsli çağa,
Etdiyi tədrisi ilan, qurbağa,
Dərs deyil, hərzəvü
hədyandı bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu...

Mən dəyişib şiveyi-əcdadımı,
Böylə oda salmaram övladımı,
Eyləmərəm dinsiz öz əhfadımı,
At çölə getsin, nə
dəbistandı bu,
Dur qaçaq, oğlum,
baş-ayaq qandı bu,
Elm adına bir quru
böhtandı bu.
Nifrətə şayandı bu,
Hərzəvü hədyandı bu,
Müslümü kafir qılan,
Xaneyi-küfrandı bu.

**Əbunəsr Şeybani**

## Məscidlər

Hamıya mə'lumdur ki, bu axır vaxtlarda Qafqaz müsəlmanları gözlərini açıb başlıyıblar hey bir ucdan məktəb binası qoymağa və indiyədək üç ilin müddətində bütün Qafqazda dörd və bir rəvayətə görə beş yerdə məktəb açılıbdır. Bu beş məktəbin üçünü iranlılar və ikisini qafqazlılar açıb və bundan savayı hələ eşidirik ki, bə'zi şəhərlərdə genə təzə məktəb söhbəti var.

Aşkardır ki, bu qədər məktəbin varlığı Qafqaz müsəlmanlarının tərəqqisinə bir böyük dəlildir. O səbəbə ki, bir yerdə ki iki il bundan irəli bircə dənə də məktəb yox idi - bu beş məktəbi biz gərək çox və çoxdan da çox hesab edək, çünki hər necə olsa yenə beş heçdən çoxdur.

Amma bircə şey var: Bir tərəfdən qonşularımız bizim belə tərəqqi etməyimizi görüb başlıyıblar narahat olmağa. Qonşularımız bundan qorxurlar ki, biz Qafqaz müsəlmanları maarifin bərəkətindən yuxarı qalxıb, qalxıb birdən atılıb minərik bunların boynuna.

Bu belə.

Bir tərəfdən də bizim köhnəpərəstlərimiz və müqəddəslərimiz görürlər ki, biz hər bir qüvvəmizi məhz məktəb açmağa sərf eliyirik, amma bir yanda məscid tikmək fikrində deyilik.

Deməli ki, qalmışıq iki odun arasında. Bir tərəfdən əcnəbilər bizə pis-pis baxıb büxl edirlər, bir tərəfdən də allah bəndələri bizi təkfir edib hər namazdan sora bizə lə'nət oxuyurlar. Çünki biçarələr elə bilirlər ki, təzə açdığımız məktəblərdə şagirdlər o qədər elm və fənn ilə özlərini məşğul edirlər ki, ibadət və allahı çağırmaq yavaş-yavaş yaddan çıxar.

Amma mən elə qanıram ki, bizim dörd-beş məktəbdən qorxan sağ tərəfdəkilər də səhv eliyirlər, sol tərəfdəkilər də müştəbeh olublar və yəqinimdir ki, əgər işin əsl həqiqəti necə ki lazımdır açılsa - nə murdar qonşularımız bizdən qorxar, nə pak hacılarımız bizdən küsər və burada heç dava-mə'rəkə lazım deyil. Məhz elə o lazımdır ki, mətləbi açmaq və işə bir tövr sülh vermək.

İşin əsl həqiqəti belədir:

Əgər bu təzə məktəblərimizi zərrəbin altına qoyub diqqət ilə baxsaq, görərik ki, bunların hər birisi birdən yekəlib bir böyük məscid oldu. Görərik ki, bir mərsiyəxan müəllim libasında durub qabaqda mərsiyə oxuyur və balaca uşaqlar da zərrəbin vasitəsi ilə yekəlib oxşuyurlar mö'min atalarına və belə şirin-şirin göz yaşı tökürlər ki, adamın az qalır bağrı çatdasın.

Hər kəs mənim sözümü zarafat hesab eləsə, mən də ona deyərəm bizim təzə məktəblərdən eləsini göstərsin ki, orada mərsiyə oxunmamış və göz yaşı tökülməmiş olsun. Elə deyəsən gözümün qabağındadır ki, günlərin bir günü məktəbin naziri içəri girib uşaqlara deyir: "Çəkin kənara taxta-tuxtanı". Bəli, Frebel üsulu ilə qayrılan məktəb skamyalarını bir-iki dəqiqənin ərzində çəkdilər kənara, otağın ortasına fərş saldılar, yuxarı başdan bir kürsü qoydular və axund gəlib əyləşdi və başladı: "Əzimallah ücurəna..."

Hələ deyək belə işlər hər gün olmur. İndi baxıb görək gündəlik dərslər nədən ibarətdirlər. Bəli, mədrəsə filandır, şəhər filan. Bir cədvəldə yazılıb dürus, yə'ni dərslər. O biri cədvəldə yazılıb şümareyi-dürus dər ərzi-həftə, yə'ni bir həftənin ərzində oxunan dərslər: Zəbani-türki 3 dərs, zəbani-Azərbaycani - 3 dərs, zəbani-türki-osmani - 3 dərs, zəbani-türki-tatari - 3 dərs, zəbani-cığatayi - 3 dərs, zəbani-farsi - 3 dərs, zəbani-ərəbi - 3 dərs, zəbani-pəhləvi - 3 dərs, cəmi 24 dərs. Hələ bu "zəban" dərsləri qalsın kənarda, çünki bu dərslərin ibadətə ya qeyri ibadətə dəxli yoxdur.

İndi gələk elm və fənn dərslərinə: şəriət - 4 dərs, moizə - 4 dərs, mərsiyə - 3 dərs, sinəzən - 5 dərs, şəkkiyyat və səhviyyat - 6 dərs, namaz və dəstəmaz - 6 dərs, cəmi 24 dərs.

Dəxi mən sözümü qurtardım. Bir tərəfdən bizi gözləri götürmüyən qonşularımızdan təvəqqə edirəm ki, çox da ehtiyat eləsinlər və məktəblərimizin övzaına

baxıb görsünlər ki, biz axirətdən savayı heç bir şey axtarmırıq və onlara hər halda mane ola bilmənik və nə qədər yuxarı da atılsaq, öz boyumuzdan yuxarı atıla bilmənik.

Behiştliklərimizdən də təvəqqə edirəm ki, məktəblərimizin proqramına baxıb görsünlər ki, bunların hər biri özlüyündə bir balaca məsciddir və dəxi bundan sora bir tikə də ürəklərini sıxmasınlar.

....................

Yuxarıda yazdığımız beş məktəbin adları belədir: Biri İttihadi-iraniyan, biri İttifaqi-Azərbaycan, biri İqbali-Salyan, biri İstiqbali-Lənkəran, biri xali-canan, biri də bali-Əmirhacıyan.

**Molla Nəsrəddin**

## YALANDIR

Bağışla ki, neçə müddətdir dinməz əyləşirəm. Belə açıb danışa bilmirəm. Dünya lap dəyişilib, nə yazmağa ehtiyac var və nə danışmağa ehtiyac var. Əgər həmişə belə ola onda... Xülasə, Nuxada müsəlman qardaşların arasında bir dostluq, bir ittifaq var (allah, sən bədnəzərdən saxla), adam lap mat qalır. Nuxada qanacaqlı, elmli adamlar o qədər var ki, nə desən ordan çıxar. Bir para ağzıgöyçəklər ağzını allah yoluna qoyub hərzə-hərzə danışır ki, guya Nuxa camaatı ədavətnən dolanırlar. Heç və'də belə şey ola bilməz, başdan-ayağa yalan-palan sözlərdir.

**Dərdmənd**

## MƏƏTTƏL

Dünyada çox az ittifaq düşüb ki, birisinə cavab verməyə aciz qalam. Həmişə hazırcavab olub hər bir kəsin sözünü haman saat rədd eləmişəm.

Amma dünən bir söz məndən soruşdular və mən cavab tapa bilməyib məəttəl qaldım.

Dünən küçədə nuxalı dostlarımdan birisi mənim qabağımı kəsib başladı məni məzəmmət eləməyə ki, ay kişi, hələ utanmırsan da köhnə soltanı pisliyib, təzəni tə'rifliyirsən? İstiyirdim ki, dostumun cavabını verəm, tez cibindən təzə soltanın şəklini çıxardıb tutdu qabağıma və bir az hirsləndi və başladı: A kişi, belə də soltan olar, belə də xəlifə olar? Dedim: Necə? Dostum bir az başını buluyub dedi:

- Ay qardaş, vallah, biz müsəlmanların bəxti yatıb, evimiz yıxılıb. Biz dedik ki, indi bəli, köhnə soltanı yendirdilər, hərçənd yaxşı soltan idi, amma nə eybi var yendirdilər, bir özgəsini qoyarlar onun yerinə, bu da onun kimi bir soltan olar. Amma sən allah, buna bax, bu da üzünü qırxdırır. A kişi, soltan da üzünü qırxdırar, xəlifə də üzünü qırxdırar, neçə milyon osmanlı əhalisinin və neçə min Nuxa və Şamaxı camaatının xəlifəsi də üzünü qırxdırar? Ax, ax, vay, vay...

Doğrusu, mən cavab verməyə məəttəl qaldım, çünki doğrudan da heç bilmədim ki, nə deyim. Elə həqiqət, soltan da üzünü qırxdırar?

Xəlifə də üzünü qırxdırar?!

Lap məəttəl qalmalı işdir.

**Dəli**

## HƏRRAC

Qafqaz əhalisinə e'lan olunur ki, Tiflis qazisi suda verilməyi cəhətinə onun yeri boşalıb və bu yerə qoyulmaq üçün adam axtarılır.

Xahiş edənlər bir ərizə yazıb qoysunlar paket içinə və ərizəyə marka əvəzinə bir neçə dənə yüzlük kağızı yapışdırsınlar. Ərizələrin hamısı cəm olandan sonra paketlər açılacaqdır və hər kəsin pulu artıq olsa, qazilik qulluğu ona veriləcək.

## KƏNDİR

Mən hələ indiyə kimi kəndirdən kəramət eşitməmişdim, amma indi eşitdim. Belə ki, boğazından asılan adamın boğazına keçən kəndirdə qəribə bir kəramət var imiş. Bu kəndirin xasiyyəti budur ki, hər kəs üstündə saxlasa, xoşbəxt olurmuş. Məsələn, hansı qumarbazın üstündə olsa uduzmaz və hansı advokat yanında saxlasa həmişə sudlarda öhdəsinə götürdüyü işlər onun mənfəətinə kəsilər imiş. Hətta Gəncədə məşhur advokat Fyodorov bir kəndirin misqalını beş manata alıb yanında saxlıyır.

Və ondan əlavə, neçə-neçələri bu kəndir məsələsini təcrübə edib nəf'ini görmüşlər imiş.

İndi, a Molla Nəsrəddin əmi! Səni and verirəm Gəncədə sentralni mehmanxanada olan rus falçısının canına və genə bir nəfər rus akuşerkasının musurman arvadlarına satdığı oğlan doğdurmaq dərmanına və Səfərabad küçəsində oğurlanmış və itmiş şeyləri tas qurub cinlər vasitəsilə tapıb sahibinə verən qoca cindarın hiyləgərliyinə ki, bu əhvalatı yazıb cəmi oxucularımıza mə'lum edəsiniz ki, onlar da bilib belə bir mücərrib şeydən faidəmənd olsunlar.

**İmza: Hatif**

## E'LAN

Balaxanı cavanlarına xəbər veririk ki, Balaxanı məktəbinin şəriət müəllimi Hacı Molla Abdulla həzrətləri həftədə altı dəfə mək-

təbdə coğrafiya elmindən leksiya oxuyur. Xahiş edənlər gəlib əyləşib qulaq asa bilərlər.

## MƏTBUATIMIZ

"Bəyənül-həqq", nömrə 464

Yaponiya məktəblərində Avropa tarixi çox müxtəsər oxunur və hətta Avropanın indiki halından müəllimlər çox az mə'lumat verirlər. Çünki qorxurlar ki, Yaponiya cavanları Avropa tarixini yaxşı biləndən sora milliyyətlərini itirsinlər.

**Molla Əbdürrəşid İbrahimov**

....................

Molla Nəsrəddin: Yaşasın qələm sahiblərimiz. Mağıl dünyanı gəzib avam caamatımıza yaxşı və doğru mə'lumat verirlər.

## NUXADAN

Ay Molla Nəsrəddin əmi! Səni and verirəm bizim Babaratma pirinə, çaharşənbə ocağına, cindar Hacı İsmayılın tasına, öskürmə pirinə, Nuxa mahalının şeyxlərinə - bizim bu bangın çilenlərinə bir əlac elə. Hərçənd bizim yerdə qurban olduqlarım pirlər, şeyxlər çoxdur, amma hamısına nəzir olunublar, yaxşı olmuyublar. Genə əsl pirləri, şeyxləri sən yaxşı tanıyırsan. Bizim bangın dörd yüz çileni bir ay bundan müqəddəm əvvəlinci sabraniya üçün məktəbə yığılmışdılar. Hansı bədzat isə orada bunlara deyir ki, axşam burada teatr oynuyacaqlar və bunlar sizin üçün teatr bileti hazır ediblər. Bu sözü eşidən kimi çilenlərin rəngi ağarıb dodaqlarının qanı qaçır. Və bərk qorxurlar və qorxudan naxoşluyub hələ düzəlmiyiblər. O qorxu dursun qıraqda, birdən çilenlər təzədən sünni, şiə azarına düşüblər. Özünüz bilirsiniz ki, bu azar həkim işi deyil. Qorxuya genə cəftə suyundan-zaddan bir növ əlac olar. Bu sünni, şiə azarı pisdir. Deyirlər ki, bu azar da mühlikdir. Buna bir əlac olsa genə səndə olacaq.

**Dərdmənd**

## ŞİRİN

Göyçay mahalında adı çox şirin bir kənd var, o kəndin adına Şəkərli deyirlər. Görürsünüzmü nə şirin addır? Kəndin özü şirin olan tək camaatı da şirindir. Amma Şəkərlinin yavuqluğunda olan Qaraməryəm kəndinin mollası Molla Abdulla Molla Əbdülhüseyn oğlu bunların ikisindən də şirindir. Bu axund üçün yeddi manat pul ki ibarət olsun iki alagöz üçlükdən və bir qaragöz ağ manatdan, dindən-imandan da şirindir. Keçək mətləb üstünə. Bir allah bəndəsinə bir allah bəndəsinin nikahlı övrəti çox şirin görünür və ona görə də gedib onu götürüb qaçır. Bunların hamısı keçəndən sora bizim İqbal məktəbimiz də çox şirindir, o qədər şirindir ki, Hacı Abdullanı özünə aşiq eliyib. Belə ki, bu allah bəndəsi həmin məktəbə o qədər kömək edir ki, yazığın nə gecə və nə gündüz rahatlığı yoxdur.

İnşallah, macal olsa, buranın şirin xəbərlərindən genə düşdükcə yazaram.

**Xeyirxahınız Palazqulaq**

## BAKI XƏBƏRLƏRİ

Bu günlər eşitdik ki, "Siyasətfürusət" ünvanlı məqaləni ədiblərimizdən bir nəfər fars dilinə tərcümə eləmək istiyir. Kaş nə olaydı, bir nəfər ədib də o məqaləni türk dilinə tərcümə edəydi ki, bizlər də oxuyub başa düşəydik.

Şairlərimizin birisinin bu günlər sövda naxoşluğu şiddət edibmiş. Öz məxsusi doktoru doktor Qafur cənablarının müalicəsi sayəsində allahülhəmd şəfa tapıb.

**Qızdırmalı**

## TELEQRAF XƏBƏRLƏRİ

....................

**Batum**. Çaral bəyləri bir qədər məbləğ cəm edib üç yerdə mübtədi məktəblər açdılar ki, rəiyyət balaları iyirmi-otuzdan sora gözlərini açıb bilsinlər ki, Çaral bəyləri nə imişlər və kimlər imişlər.

## POÇTA QUTUSU

....................

Salyanda Bədəlov cənablarına: Qocayev ilə aranızda olan hesab xüsusi işlərinizdir və camaat üçün əhəmiyyəti yoxdur ki, çap edək.

....................

Vladiqafqazda "Bir adam"a: Bizdən çox-çox təvəqqə edirsiniz ki, kağızınızı çap edək: Biz də sizdən çox-çox təvəqqə edirik ki, bizdən o cür təvəqqələri eləmiyəsiniz.

....................

Şuşada "Bir dərdli" imzası ilə kağız göndərənə: Kağızınızın çap olunmağından dərdinizə bir çarə hasil ola bilməz. Məsləhət budur ki, ya Ordubadda "Nəxl" pirinə, ya Keşlə kəndində Fatma xalanın pirinə nəzir deyəsiniz.

Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə.

## E'L A N

E'lan edirəm ki, meyvələri alıb satmaq üçün may ayının birindən Pyatiqorsk şəhərində komisyonnu kantora açmışam. Komissiya ilə hər qisim meyvə və yemişləri alıb satıram, qabların sınıb xarab olmağına cavab verirəm. Meyvə sahibi beş illik müddətinə kimi hesab kitablarını təhqiq eləməyə muxtardır. Bağ sahibləri, icarədarları və meyvə komisyonçuları işlərimdən baxəbər olub e'tibar edə bilərlər.

Adres: Pyatiqorsk şəhərində, Terski oblastda, Məşədi Həsənqulu Ələsgər oğlu Qurbanov.

г. Пятигорскъ (Терской области). Машади Гасанъ Алескеръ оглы КУРБАНОВЪ.

Teleqram üçün: Пятигорскъ, КУРБАНОВЪ

## E'LAN

"Söhbət basəri-rəfiqəm və ya naleyi-qəribaneyi-Neyyir" açıq və şirin fars dilində yazılmış 63 səhifədən ibarət olan həmin kitab 25 bənd nəzm ilə vətənin halı yolunda nalə edir. Bu kitab "Qeyrət" mətbəəsində təzə çapdan çıxıb mövqeyi-intişara qoyuldu. Qiyməti 40 qəpik.

Xahiş edənlər bu adresə rücu' etsinlər: Tiflisdə, altıncı hissədə, Botaniçeski küçədə, 9 nömrəli evdə, şair Neyyir cənablarına, yainki "Molla Nəsrəddin" idarəsinə.

Həmin şairin "Mir'ati -vətən" adlı təzə çapdan çıxmış kitabı yenə satılmaqdadır. Qiyməti 10 qəpik. Xahiş edənlər həmin adresə rücu'etsinlər.



## E'LAN

Kitabxanamızda hər cür məktəbə və maarifə dair kitablar mövcuddur. Kitab Təşrihəl-fəraiz, Risaleyi-zibdətül-əhkam, Ümdətül-əhkam, Əcəm dili, Uşaq bağçası, Nəsihətül-ətfal, Tərcümeyi-töhfeyi-nəsuhiyyə və Təfsirəl-Qur'an əsəri -Mövlazadə və Təbrizin xəritəsi 60 qəpiyə və kitab Tacül-təvarix-əmiri-əfğan Hacı Ələsgər Məhəmmədzadə kitabfüruş dükanında satılır.

# "Молла Насрединъ"

*КОНТОРА и РЕДАКЦИЯ*
журнала
"Молла Насрединъ"
Тифлисъ
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

***ЦѢНА на ГОДЪ***
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
***ЦѢНА за ОБЪЯВЛЕНИЯ***
*За место занимаемое строкою*
*петита впереди текста ...10 коп.*
*позади " " " ...7 коп.*



ملائکه آسمان دنیا
برصورت گاوند و نام
اون اسماعیل است

Ангелы пер-
ваго неба



ملائکه آسمان دوّم
برصورت عقاب اند
نام او ینخائیل است

Ангелы вто-
рого неба



ملائکه آسمان سوّم
برصورت پسراند نام
او صاعد یائیل است

Ангелы
третьяго
неба.



ملائکه آسمان چهارم
برصورت بنی آدم
اند ' نام او روبائیل
است

Ангелы чет
верт. неба.



ملائکه آسمان پنجم
برصورت حورالعین
اند نام او کلکائیل
است.

Ангелы пят.
неба.



ملائکه آسمان ششم
برصورت ولدان
اند و نام او تمخائیل
است

Ангелы шесто-
го неба.



و ملائکه آسمان هفتم
برصورت اسب اند
و نام او صلصائیل است

Ангелы седьмого
неба.

Страница изъ иллюстрированнаго учебника космографіи.



Həzərat! Elmin cümləyə fərz olduğuna dair yüzlərcə
ayət və hədislər var. Yevropalılar bizim köhnə elmimizi alıb mədəniyyətə vasil olublar, amma biz dala qalmışıq...

1909г. ١٩٠٩

# ملا نصر الدين

№21. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپک ۲۱



Литог. С. Былова

Kəblə Qurban, təqlidin kimədi?




"Orenburqda birinci məhəllə imamı Vəli Həzrət müsəlmanları inandırıb ki, şəhər pulu ilə açılan məktəbdə uşaq oxutmaq haramdır və bu fəndnən məhəllə uşaqlarını məktəbdən kənar eliyir ki, özü onları oxutsun". (Vəqt" qəzeti, nömrə 457)

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д. 24.*

Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

E'lan qiyməti

Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

**17 cəmadiyəl-əvvəl 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 24 may 1909**



## ÜÇ YÜZ MİLYON

**(Maşallah)**

Axır vaxtlarda bə'zi "millətpərəstlərimiz" bir cür "mücahidliyi" özlərinə adət eliyiblər. Məsələn, xəta olur ki, bir nəfər Məşədi Həsən əlində bir kasa qatıq yol ilə gedən yerdə bir nəfər İvan buna naqafil toxuna və məşədinin qabı əlindən düşə və qatığı tökülə yerə.

Bunu eşidən kimi "millətpərəstlərimiz" o saat çıxırlar bir uca damın üstünə və əllərini qulaqlarına qoyub bar-bar bağırırlar: "Ay müsəlman qardaşlar, görürsünüzmü ki, haramzada İvan murdar ola-ola necə müsəlmanlardan utanmadı, necə üç yüz milyon bir camaatdan qorxmuyub Məşədi Həsənimizin qatığını tökdü küçədə torpaqların üstünə? Vay-vay, ar olsun bizə, hələ durub baxırıq, hələ bu binamusluğu qəbul eliyirik.

Amma mən deyirəm ki, belə "millətpərəstliyin" istiotu bir az çoxdur, az qalır adamın ağzını yandırsın. Mən belə qanıram ki, İvan əgər qəflətən Məşədi Həsənin qatığını tökmüş olsa, günahı o qədər azdır ki, bundan ötrü minarəyə çıxmaq lazım deyil. Əgər qəsd ilə tökmüş olsa, burada İvana bir balaca nəsihətdən savayı heç özgə bir atılıb-düşməyə ehtiyac yoxdur.

Xeyr, əgər "millətpərəstlərimiz" həqiqətdə millətpərəstlik eləmək xəyalında olmuş olsalar, o və'də gərək əllərinə elə bəhanələr salalar ki, "İskəndəri-Ruminin böyüklüyünü tə'rif edə-edə stulları sındırmıyalar".

Kimdir camaatımızın düşmənləri? Hər kəs desə ki, "əcnəbilərdir", burada o qədər bir hünər göstərməyib, o səbəbə ki, bu sözü biz uşaqlıqda kürsü başında Fatma xalalarımızdan da eşitmişik. Bəlkə də elə bu sözün əsli var, çünki əcnəbilərin bizə olan məhəbbətindən də mən hələ bir elə nişanələr görməmişəm.

Amma mən onu deyirəm ki, köhnə xirmənləri sovurmaqdansa, təzə sözləri ortaya qoymaq lazımdır. Nə olar ki, hamıya mə'lum olan düşmənlərimizi bir saatlığa qoyaq kənara və bir az da öz ətrafımıza baxıb görək öz içimizdə nələr var.

Oxuculardan təvəqqə edirəm ki, müxbirimiz Mozalan bəy Ordubad və Əylis barəsində yazdığı sözlərə bir qədər əhəmiyyət versinlər. Bu işləri səhl saymaq ol-







maz - huşyar olmaq lazımdır. Hər kəs dünyanın təqazasına bir az bələddirsə, indidən gərək yəqin eliyə ki, Ordubad cəhaləti Əylis mədəniyyətinin qabağında dayana bilməz. Ətrafımızda müşahidə olunan politika vüquatı bizə bir böyük dərsdir, hələ tarix qalsın kənarda.

İvan Həsənin qatığını vurub yerə tökəndə üç yüz milyon müsəlman tərəfindən İvana üç yüz milyon nifrət teleqramı işləyir, amma Ordubadda seyid Mürtəza və Ağ Seyidin oğlu poçt yoluna adamlar düzüb qəzetə oxuyanları asdırıb-kəsdirəndə biz dinmirik.

Bir Ordubad deyil, götürək İrəvan kimi bir böyük müsəlman şəhərini. Allah şahiddir ki, burada nə bir nəfər müsəlman vəkili, nə bir nəfər müsəlman həkimi, nə bir nəfər müsəlman oxumuşu, xülasə, Ordubad kimi burada da bircə nəfər adam tapıla bilməz.

Niyə?

Səbəbi budur ki, əlli il bundan irəli burada məktəblər açılandan indiyədək tək qazimiz məvacibin hörmətinə hər gün məktəbə gedib ruslar ilə əl-ələ verəndə müsəlman məhəlləsinə gələn kimi əllərini yuva-yuva və murdar əcnəbi müəllimlərini söyə-söyə əcnəbi elmini müsəlmanların nəzərinə hər gün və hər saat haram cərgəsinə daxil eliyibdir.

Və indi genə İrəvan gimnaziyasının beş-on nəfər müsəlman şagirdləri yavaş-yavaş başlıyırlar dərsdən qaçmağa.

Kimdir bizim düşmənlərimiz? Əcnəbilər də olsa, onların düşmənçiliyi hələ ki ehtimal olunan bir şeydir. Amma o əcnəbilərin birinin yolu əgər düşə bizim vilayətə və şeyxlərimizin övrətbazlığından baxəbər ola - gedib dünyaya xəbər verəcək ki, müsəlman millətində bircə tikə namus yoxdur.

Harada qalıbdır bizim "millət başçıları"?

Kimdir bizim düşmənlərimiz?

**Molla Nəsrəddin**

## TƏZƏ BANK

Müşirül-bikar və füruşi-millət Hacının fitvasına görə Qax bazarında İlisu və Qax cahilləri üçün şərabxana ünvanında ikinci bir daha bank açıldı. Cahillərə müjdə olsun və naxçıvanlılara ibrət olsun. Hacı əfəndi belə məsləhət görür ki, cahillər durmasınlar və pullarını aparıb həmin banklara qoysunlar.

**Molla İsmayıl**

Ay Molla dayı! Sən elə həmişə deyirsən ki, müsəlman milləti geri qalıbdı, müsəlman içində təzə bir şey ixtira edən yoxdu. Mən sənə bir təzə xəbər verirəm, sən də amerikalıları tə'rif edəndə bunu onlara deyərsən, dəxi qoy lal olsunlar, dəxi bizi çox məzəmmət eləməsinlər. Bu günlərdə, yə'ni olar bir ay bundan irəli bizim Şahtaxtı kəndinə heç yağış yağmırdı, camaat neçə dəfə o kənddə olan İydəli pirinə müsəllaya getdilər, genə yağış yağmadı. Bir gün kəndin mollası Molla İsmayıl dedi ki, "mən yağış yağdıraram". Camaat haman saat ona bir neçə manat yığıb verdilər. Molla İsmayıl pulu alandan sora camaata dedi ki, "bura bir eşşək gətirin". Mənim öz gözümün qabağında Molla İsmayıl iki rük'ət hacət namazı qılıb başladı eşşəyin başın yumağa: su eşşəyin başına töküləm kimi yağış başladı şiddətli yağmağa, eşşəyin başı quruyandan sora yağış kəsdi. İndi qoy Avropa adamları deməsinlər müsəlmanlar bielmdir. Bizim üləmalar özləri həmişə elmlərini büruzə vermək istəmirlər, yoxsa keyfləri istiyəndə yağış yağdırarlar, keyfləri istəmiyəndə yağdırmazlar.

**İmza: Gecəquşu**

## HACI YUNİS

Millət yolunda heç bir xidmət itib yaddan çıxmaz.

Cavad mahalında Tağıyevin agenti Hacı Yunisdən idarəmizə axır vaxtlarda çox razılıq kağızları gəlməkdədir. Mə'lum olur ki, əlsiz-ayaqsız Hacı Yunis tərəfindən yetişən yaxşılığın həddü hesabı yoxdur.

Biz də öz tərəfimizdən Hacı cənablarına öz təşəkkürümüzü izhar edirik və Hacının dostlarına xəbər veririk ki, əgər bu zati-alinin əksini ələ gətirə bilsəydik, məcmuəmizin bir səhifəsini Hacının qamətli və şücaətli şəkli ilə zinətləndirərdik. Hərçənd idarəmizə Hacı Yunisin fotoqrafiyası bir allah bəndəsi tərəfindən göndərilib, amma haman fotoqrafiya bir az naqisdir.

## QƏNAƏT

Atalar yaxşı deyiblər ki, qənaət kimyadır. Hər bir şey çox işlənsə, əlbəttə, tez qurtarar. Götürək Nuxa cavanlarını ki, biri-biri ilə müsəlmanca danışanda müsəlman sözlərinə qənaət eliyib aralığa rus sözləri qatırlar və yaxşı da eliyirlər. Əgər belə eləməsələr, yə'ni əgər müsəlman sözlərini çox işlətsələr, əlbət ki, yavaş-yavaş qurtarar, çünki hər bir şey məsrəf olunsa, tez də qurtarar.

Xüsusən, pul.

Hamıya mə'lumdur ki, Vladiqafqazda "Novruz" mədrəsəsi bir il bundan qabaq az qalırdı ki, bağlansın, ondan ötrü ki, pulu az idi və ağıllı adamların tədbiri olmasaydı, indi mədrəsə çoxdan bağlanmışdı. Allah rast saldı ki, qənaət hikməti burada yada düşdü və rişsəfidlər e'lan elədilər ki, hər kəs yarı məvacibinə dərs verməyi qəbul eləsə, onu məktəbə qəbul eləsinlər və köhnə müəllimləri çıxartsınlar. Belə ki, dörd ay bundan irəli Vladiqafqaza təzə varid olan bir cavanı ağsaqqallar çağırıb təklif elədilər ki, əgər köhnə müəllimlər aldığı məvacibin yarısına dərs vermək istəsə, bir ərizə pişnihad eləsin, cavan razı olur və köhnə müəllimi çıxardıb bunu qoyurlar onun yerinə.

İndi genə Vladiqafqaza bir təzə adam yetişən kimi məktəb və-

killəri vağzalda yapışırlar yaxasından və soruşurlar ki, əgər yarı məvacibə müəllimlik eləməyə razı olsa, ərizə versin.

Xülasə, qənaət yaxşı bir şeydir. Qeyr yerlərdə də kasıb düşən məktəb vəkillərinə məsləhət görürük ki, müəllimə məvacib verməkdə israf eləməsinlər və hər kəs yarı məvacibə qulluq eləmək istəsə, onu də'vət edib köhnəni çıxardıb qovsunlar getsin işinə.

Bu yaxşı qaydadır.

**Lağlağı**

## CƏFƏNGİYAT

Ay Molla Nəsrəddin əmi! Oturmusan Tiflisdə, heç bizim Nuxadan xəbərin yoxdur. Axırı ki dünyanın hər işi çevrilib başdan-ayağa məsxərə olubdur. Bizim Nuxada bir müəllim var, həmi uşaqları başdan çıxardır və həmi böyükləri. Biz görmüşdük uşaqlar dərsə gedəndə dörd ay əlif-bey oxuyurlar, iki ildə rəbbi-yəsiri və üç ayda əbcədi və sora yavaş-yavaş Qur'an oxumağa başlayıb. Dörd-beş ildə Qur'an oxumağı bacarardılar və bir qədər də nəcasatdən, təharətdən, qüsldən, cünbülkədən, heyz və nifasdan öyrənərdilər. Daha artıq əllameyi-əsr olmaq istəyənlər Tarixi-Mö'cəmdən, Hafiz və "Bustan"dan və Tərəssüldən oxuyurdular. İndi o müəllim iki ayda uşaqlara oxumaq-yazmaq öyrədib başlıyır it və pişik nağılından, meymun və çeşmək nağılından, nə bilim ayı və eşşək nağılından oxudur. Bir az sora da yer belə hərrənir, gün, ay bu səbəbə tutulur, buxaratdan bulut, bulutdan yağış əmələ gəlir. Nə bilim ağla, beyinə batmıyan sözlər öyrədir. Bir də məktəbin yanında bir kitabxana açıb adını qoyub İslam, gətirib İstambuldan cəfəngiyat kitablarını doldurubdur. Ötənə, keçənə deyir: "Siz türksünüz və bu türk kitablarından alın oxuyun". Bir dəstə kitab yığıb deyir: "Bunlar ədəbiyyata dairdir". Bir dəstəsinə deyir teatroya dairdir. Bir dəstəsinə deyir romanlara dairdir. Bir dəstəsinə deyir tarix və səyahətə dairdir. Nə bilim cürbəcür adlar.

Biz heç qanmırıq ki, türk və türk dili nədir. Genə qabaqda Osmanlıdan yaxşı kitablar gələrdi. Məsələn, Ənvarül-aşiqin, Hədiqətül-övliya, Ulduznamə, Falnamə, Çehil sual, Şah İsmayıl, Xeyrbər qalası, Tə'birnamə, Cəngnamə. İndi bu kitabların heç biri yoxdur. İrandan gözəl kitablar gələrdi, bular da yoxdur. Bu kitablardan soruşanda müəllim deyir ki, "A canım, o kitabların dövranı bitdi, indi elm və fünun dövranıdır. Osmanlıdan hürriyyətdən sora gözəl türk kitabları gəlibdir, siz türksünüz, alın bu türk kitablarından oxuyun". Daha biçarə müəllim demir ki, bizim zəhləmiz hürriyyətdən, məşrubatdan gedir. Elə bu türk kitabları, bu bic-bic sözləri yazan kitablar olmadımı məşrutabı, hürriyyəti meydana tulluyan? İndi dünyanın işi olubdur belə, müəllimlərimiz belə, kitabçılarımız belə. Biz indi o köhnə kitabları axtarırıq. Aman günüdür, Molla dayı, o kitablar harada satılırsa bizə xəbər ver.

**Dədmənd**

## KÖHNƏLƏR

Oldu siyəhpuş bütün köhnələr!
Dərd-qəmə tuş bütün köhnələr!

....................

Qıldı fələk bəxtlərin vajgun, Dolma-badımcan qabını sərnigun,
Oldu ədəm ölkəsinə rəhnümun,
İşləri məğşuş bütün köhnələr!
Dərd-qəmə tuş bütün köhnələr!

....................

Hər gün itib-batmadadır xanları,
Mollaları, şeyx və işanları,
Bəyləri, sahibləri, soltanları,
Məş'əli xamuş bütün köhnələr!
Oldu siyəhpuş bütün köhnələr!

....................

Kamlarınca yerimir işləri,
Batmıyır andır bu ətə dişləri,
Oxları, nə nizələri, şişləri,
Oldula mədhuş bütün köhnələr!
Hər işə sərpuş bütün köhnələr!

....................

Bilmədilər elm nə, irfan nədir,
Hübbi-bəşər, rəhməti-vicdan nədir,
Həqq, hüquq, zən, nisvan nədir,
Cəhlə həmağuş bütün köhnələr!
Zalimə papuş bütün köhnələr!

....................

Tazələr allanmadı övradına,
Sərvət, şövkətlərinə, adına,
Düşməyir əsla birinin yadına,
Oldu fəramuş bütün köhnələr!
İşləri məğşuş bütün köhnələr!

....................

Gah müqəllid, gah olur müctəhid,
Gah fədai, gəhi lap müstəbid,
Gah axır qanı, gəhi müncəmid,
Gahi də bihuş bütün köhnələr!
Bisər, biguş bütün köhnələr!
Süst və mədhuş bütün köhnələr!

**Keyfsiz**

## ORDUBAD

Ordubad camaatı Ərəblinskinin drama dəstəsindən təvəqqə eliyib ki, ora da iyirmi dəfə teatr gətirsin və hər dəfəsinə səkkiz yüz manat təklif eliyir. Ərəblinski hər

teatr oynamağına min iki yüz manat istiyib. Güman var sövdaları tuta (sövda deyəndə xalq Şamaxı sövdasını başa düşməsin). Xülasə, əhvalat bu qərar ilədir. Əylis camaatı ordubadlıların gözlərinin açılmağına həsəd aparırlar.

Əgər müsəlman dəstəsi Ordubada getməli olsa, qız mükaliməlılərini Ordubad qızlarından oynuyacaqlar, dəxi oraya artistka aparmaq lazım olmuyacaq.

Ordubad camaatından təvəqqəmiz budur ki, bizi bağışlasınlar, çünki iş belə gətirdi ki, burada utanmaz-utanmaz qız sözü danışdıq.

Ordubaddan sora dəstənin xəyalı Danabaş kəndinə təşrif gətirməkdir. Amma buranın teatrı Ordubadın teatrından da mükəmməldir.

Əylis səfərimi gələn həftə yazaram.

**Məşədi Mozalan bəy**

---

## *HACI LƏKLƏK*

Hədisi-mö'təbərdə yazırlar ki, bir gün Həzrəti-Molla Nəsrəddin gördü Hacı Ləkləki. Baxdı, baxdı, dedi: "Yox, belə quş olmaz". Tutdu Hacı Ləkləkin ayaqların kəsdi qoydu qarnı üstə dedi: "Bax, indi quşa oxşuyursan". Bəli, hər şeyin bir oxşarı var. Məsələn, eşitsək ki, İranda çox toyda mərsiyə oxudurlar, o saat inanarıq, çünki vaqiən iş müsəlman işinə oxşuyur. Ya eşitsək ki, filan müsəlman şəhərində əkabirlər mütrüb gətirdib, iki gecə-gündüz mütrüb oynadıblar, heç fikir etməmiş inanarıq. Zikr deyib coşmaq, zəncir vurmaq, gavahin taxmaq, qoç döyüşdürmək, bildirçin, xoruz, it, pişik dalaşdırmaq, özləri bir-birin qırmaq, qərəz, nə qədər belə-belə şeylər eşitsək ki, filan şəhərin müsəlmanları eliyir, bir təbii söz eşidən kimi dərhal inanarıq.

Biz birdən nə eşitdik? Eşitdik ki, Nuxa şəhərində müsəlmanlar ittifaq edib, bank açıblar.

Çe çe çe??? Əstəğfürullah. Ha fikir eliyirəm, a canım, "müsəlman", "ittifaq", "bank", yə'ni çe? Müsəlman hansı, bank hansı? Hələ bir az sora eşitdik ki, çox yaxşı münəzzəm surətdə qabaq gedir. Qaldıq belə, inanmıyaq, necə inanmıyaq? Aləm deyir, hamı danışır, qəzetələr yazır. Ya inanaq, necə inanaq? Hacı Ləklək quşa oxşamıyan kimi, bank da heç müsəlman işinə oxşamır axı!

Xülaseyi-kəlam, bax indi oldu. Buna nə demişəm. İndi tamam oxşuyur. Ədavət, sünni-şiə sözü, nifaq, ixtilaf tamam müsəlman işi. Bax indicə oxşuyur. Buna heç kəsin sözü ola bilməz. İndi quşa oxşuyursan.

**Qızdırmalı**

---

## *QAFQAZ XƏBƏRLƏRİ*

.....................

**Salyan.** Təzə alınan xəbərlərə görə Salyan camaatının hamısının təqlidi Şeyx Fəzlullah cənablarınadır.

.....................

**İrəvan.** İrəvandan çox tərəqqi xəbərləri gəlməkdədir. Təfsilini sora yazarıq. Hətta belə söz də deyirlər ki, Tiflisdə açılan arvad darülfünununa İrəvan müsəlman qızları tərəfindən 36 ərizə gəlib ki, bunları da qəbul eləsinlər.

---

## *Poçta qutusu*

.....................

Ağdaşda "Vəssalam"a: Məsləhət budur ki, dişi çıxan uşağın atasının adının əvəzinə öz adını yazasız.

.....................

Bakıda "Gecə quşu"ya: Bir məktubunuzu çap elədik, amma o birini tulladıq və Molla Əsgərə sataşmağı lazım bilmədik.

.....................

Bakıda "Dostumuz Xadimihəqq"ə: Bizim qəsdimiz o cür deyil ki, siz xəyal eliyirsiniz. Söhbət bir az köhnələndən sora bu barədə genə danışarıq.

.....................

Gəncədə "Bir nəfər"ə" Yazırsan ki, kağızınızı çap edək. Nə deyirsən de, bircə bunu xəyalından çıxart.

.....................

Ağdamda namə'lum şəxsə: Konsul barəsində yazılan çap olunmadı.

---

Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə.

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə Varansovski - Vrangelski küçələrin küncündə, Məşədi Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

# “Молла Насрединъ”

**КОНТОРА и РЕДАКЦИЯ**
**журнала**
**“Молла Насреддинъ”**
**Тифлисъ**
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

***ЦѢНА на ГОДЪ***
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
***ЦѢНА за ОБЪЯВЛЕНИЯ***
*За место занимаемое строкою*
*петита впереди текста .....10 коп.*
*позади * * * .....7 коп.*




Sən Allah, dünyanın işinə bax: milyonlarım
Almaniya banklarında yata-yata, mən burada yavan bozbaşa möhtac olmuşam.




Въ банѣ (Нахичевань)

Hamamda ibadət (Naxçıvanda)

# ملا نصر الدين

№22. Цѣна 12 к. **МОЛЛА НАСРЕДДИНЪ** قیمتی ۱۲ قپک ۲۲





Литог. С. Быхова

Allahū əkbər, Allahū əkbər!.. (Nuxada mömin qumarbazlar)




Sual: Məşədi Qasım, bu uşaqlar deyəsən sənin oğlanlarındı?
Cavab: Bəli, saki mənim oğlanlarımdı.
Sual: Necə yəni "saki"?
Cavab: A kişi, görmürsən biri oxuyub nə günə düşüb?

**ABUNƏ QİYMƏTİ**
Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
***Tiflis, Davıdov küçəsi, nömrə 24.***
***Тифлисъ, Давидовская ул., д. 24.***

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**

**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**24 cəmadiyəl-əvvəl 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 31 may 1909**



## Qurddan çoban

"İttifaq" qəzetəsinin 112-ci nömrəsində " Qurddan çoban" adlı məqaləsini uzaqdan görən kimi öz-özümə dedim ki, vallah, bu qəzetələr bilmirəm bu mollalardan nə istiyirlər, nə daraşıblar bu axund və əfəndi və şeyx və müftilərin canına? Başdan bir-iki sətir oxuyub gördüm ki, söhbət Türküstan vilayətindən başlanıb və mən o saat yəqin elədim ki, məqalə sahibi Səmərqənd müftisi Məhəmməd Bəqa xacəyə qurddan çoban ad qoymaq istiyir. Bir az da məqalədən oxudum gördüm "Türküstan vilayəti qəzetəsi"nin də söhbəti aralığa gəldi və indi dəxi lap yəqin elədim ki, bəli, biçarə Məhəmməd Bəqanın evi yıxıldı. Yəqin elədim ki, məqalə sahibi axırda mətləbi bu yerə yetirəcək ki, Səmərqənd müftisinin başına özgə bir qəzetə qəhətdir ki, Ostroumov kimi bir misyonerin qəzetəsində uzun-uzun felyetonlar yazır.

Hərçənd məqalədə Məhəmməd Bəqa xacənin adı yoxdur, amma vallah, bu bijliklər keçməz. Xacə əfəndini belə fəndlər ilə tovlamaq olmaz. Bu ona oxşuyur ki, "qızım, sənə deyirəm, gəlinim, sən eşit". Əgər həqiqətdə Ostroumov özünü qoyub misyonerliyə və öz qəzetəsi vasitəsi ilə öz murdar fikrini Türküstan vilayətinin ikiayaqlı heyvanlarına soxmaq xəyalındadır, - elədə bəs Səmərqənd müftisi niyə öz qələmi ilə bu qəzetəyə şərakət edir? Dadaşım, əgər Ostroumov misyonerdi, elədə Məhəmməd Bəqa əfəndi də oldu onun qardaşı və yoldaşı. Əgər sən sübuta yetirsən ki, xeyr, Səmərqənd müftisi misyonerə yoldaş ola bilməz, o və'də mən də səndən təvəqqə edirəm ki, Məhəmməd Bəqa əfəndiyə də bir ad qoyasan.



Yox, yox, möhtərəm bir vücuda sataşmağın heç mə'nası yoxdur və insafdan kənar bir işdir. Bir qəzetəni tənqid edəndə lazımdır qabaqca bir baxıb görmək ki, kimdir bu qəzetənin mühərrirləri? Bir surətdə ki sən "Türküstan vilayəti qəzetəsinə misyoner adı qoydun - dəxi qurtardı getdi, çünki sənin sözündən bu çıxır ki, hər bir kəs bu qəzetəyə bir sətir də olmuş olsa yazıbsa, yəqin ki, qəzetənin məsləkinə şərikdir.



Səmərqənd müftisinin həmin qəzetədə o qədər məqalələri var ki, yığıb cəm eləsən, "Cameyi-Abbas" kitabından mö'təbər bir kitab olar.

Yox, yox, mərdimazarlıq bir şey deyil.

**Lağlağı**



**"Nur" mədrəsəsinin imtahanını qəzetələr belə tə'rif edirlər**

"Nur" mədrəsəsində cümə günü imtahan olunurdu. İmtahan yüz sualdan ibarət idi, cümləsindən üsuliddin, fürüiddin müfəssələn, tövhid, nübüvvət, ədalət, imamət və on füruiddin müfəssələn, sifəti-sübutiyyə və sülbiyyə, müqəddimat, müqarinat və sair fərayiz. Bundan əlavə, tarix müfəssələn və keçən ənbiyaların əhvalatı. Artıq dərəcədə gözəl cavab verdilər. Bir nəfər də olsa nöqsan mülahizə olunmurdu. Mübtədi şagirdlər altı-yeddi ayın zərfində Qur'ani-şərifi oxumamış tə'limsiz hürufatı tə'lim almaq münasibətilə gözəl vəch ilə qiraət edirdilər və təcvid qaydası ilə gözəl cavab verirdilər və Qur'ani-şərifi oxuyan halda 8,9,10 və 11 yaşında şagirdlər sərf-nəhv qaydasına müvafiq fail, məf'ul, müzafileyh və sairələrin tapmaqda aciz qalmırdılar. "Nur" məktəbindən başqa qeyr təzə bina olan məktəblərdə Qur'ani-şərif bu növ tə'lim olunmadığından bu mədrəsə layiqi-təhniyyətdir. Məclisdə olan həzəratdan Hacı Molla ağa Rəsulzadə, Hacı Molla Ruhulla axund, Molla ağa, Mir Əbdüləli, Əli Əkbər xan, Hacı Seyid Musa, konsul Mübəssərül-Mülk, Hüseyn Kamal, Mir Ələsgər, Mir Əliəkbər, Amir Hadi, Hacı Rizvan, Məhəmmədəli, Həllac, Hacı Əbdülxaliq, yüz nəfərdən ziyadə tüccar və ə'yanlardan hazır idilər. Gözəl vəch ilə imtahan olunub diqqət üzrə sual olunurdu. Yaşasın banilər və müdir cənabları, təhsin olunmağa layiqdirlər. İnsaf əhli əgər təəmmül üzrə qərəzi kənara qoyub danışalar, deyərlər ki, **bə'zi mollalarımız belə bunlar dərəcədə təcvid elminə dara deyillər.** Ərəbi dərsindən dəxi imtahan olundular, bu sinndə kiçik balaların bu az vaxtda bu qədər şeylərə cavab verməsi qəribə halət deyilmi? 13 nəfər ərəbi oxuyan şagirdlər ki, 8,9,10,11,12 sinndə idilər, əmsələyi-müxtəlifədə və qeyr qaydalarda intiha dərəcə məharət göstərdilər, **"Ənmüzəc"in bə'zi ibarətlərini əzbərdən cavab verirdilər.** Şayani-təəccüb burasıdır ki, **altı ayın müddətində dərsi bu az sinndə balalar səkkiz-doqquz cür oxuyublar** və əlavə ərəbini də bu dərəcədə cavab verirlər. Əsl məqsədimiz nəqdən məhz haman bu "Nur" məktəbindən hasil olacağına ümidimiz nəxli orada səmər verəcəyinə ümidvar olub allah-taaladan tofiq istəyirik.

**Bir bakılı**

**Molla Nəsrəddin**

Həqiqət, cənab "Bir bakılı" buyuran kimi əgər insaf əhli qərəzi kənara qoya və görə ki, "Nur" mədrəsəsinin 9,10,11,12 yaşında uşaqcıqları "Ənmüzəc"in bə'zi ibarətlərini əzbərdən cavab verirlər və hətta təcvid elmində bə'zi mollalarımızdan da artıq daradırlar, o vaxt insaf əhli yəqin edir ki, ümidimizin nəxli olan "Nur" mədrəsəsinə şəkk gətirən gərək ata və anasından bixəbər və allah dərgahından üz çöndərmiş bir bidin adam ola.

Vaqeən belədir.

Amma çox heyf ki, məqalə sahibinin fərmayişindən mə'lum olmur ki, aya, kimdir bu uşaqları bülbül eliyib ümid ağacına çıxardan? Aya, kimdir bu bostanın əkinçisi? Əgər biz bunu bilseydik, allah-taalanın dərgahına əl qalxızıb səbəbkara xeyir-dua elərdik.

Amma bunu bilmirik və elə güman edirik ki, "Nur" mədrəsəsinin tərəqqisinin fəxri və müdir cənablarına və nə qeyr bir kəsə çata bilər və allahın özündən savayı heç kəsə çata bilməz və səbəbi də budur ki, işlərin hamısı mö'cüz kimi bir şeydir.

Biz buna inana bilmənik ki, allah-taalanın iltifatı olmuyan yerdə 9 ya 12 yaşında bir qoçu balası altı ayın müddətində təcvid elmini bə'zi mollalardan artıq sahiblənə bilə. Bu bir mö'cüzədir və mə'lum şeydir ki, təbiətdən kənar işlər allah-taalanın lütfü və mərhəməti olmuyan yerdə əmələ gələ bilməz.

Musa peyğəmbər yaşının bir aylığında anası ilə başladı danışmağa və ərəb hərflərini elə bir məxrəc ilə əda edirdi ki, guya əlli il dərs oxuyub.

Kimdir Musanı danışdıran?

"Nur" məktəbinin uşaqları da Musa kimi, maşallah, mö'cüz göstərirlər. Kimdir bunlara səbəb? Heç kəs deyil, bir allahdan savayı.

Səd həzaran tifli-sər bebrudə şüd,
Ta kəlimullah Sahibdidə şüd.

Görək Qızdırmalı nə deyir:

**Nəzm:**

Məktəbi-"Nur"ə verilib imtahan,
Elm odur, dərs odur, iş haman.
Bu gediş ilə ki gedir sarvan,
Mənzilə yetməz əbəda karvan.

Ay dədə, fikr et ki,
müsəlman nədir?
Elm nədir, quli-biyaban nədir?
Əsrə münasib ədəbistan nədir?

## *Qafqaz xəbərləri*

**Lahıc**-Buraya dörd mərsiyəxan və altı dərviş gəlib, məhlələrdə vurçatdasındır. Hər yandan mərsiyə və qəsidə səsi gəlməkdədir. Mərsiyəxanlar yolun ağzına adam düzüblər ki, qəzetələri qoymasınlar buraya gəlsin. Dərə xəlvət, tülkü bəylikdir. Adamın yadına İrəvan düşür.

**Şuşa** - Bu saat şəhərdə bir nəfər də molla qalmıyıb. Hamısı dağılıb kəndlərə kəbin kəsməyə.

## Molla Məhəmməd Əfəndi

**(Dərdməndə cavab)**

"Molla Nəsrəddin"in 21-ci nömrəsində köhnə kitablarımız "Çehil sual", "Ənvarül-aşiq"in harada olmağını xəbər alırsan. Görünür ki, bu qisim kitablara çox mailsən və hərgah yerini bilmək istiyirsən, iltifat elə xidməti-şərifinə ərz eliyim. Görünür ki, bu növ kitablara siz şəkililərdən başqa heç kəs mail deyil; sual da Şəkidəndir, tələb də oradandır. Gəncədə kimdən xəbər aldımsa, heç kəsdə tapılmadı, məgər bir nəfər şəkilidə ki, o da ola məşhur küçə suluyan Molla Məhəmməd əfəndi. Hərçənd bu hərifin bilmərrə savadı yoxdur, lakin sən istədiyin kitablardan iki-üçünü çantasına doldurub seyidlər biçin vaxtı çöllülərin canlarına daraşan kimi daraşıb Gəncə arvadlarının canına, köhnə peşəsini bilmərrə atıb kənara, dua yazmağa, tasa baxmağa, rəml atmağa qurşanıb. Allahın bərəkətindən də gündə Ballı xalaya beş-altı manat cibxərcliyi, piti pulu, hamam və həna pulu da olur. Qabaqda küçə suluyan indi çiynində "baldun", əlində əsa, belində qurşaq, dodaqları mırtıldıya-mırtıldıya arvadlar məclisinin yaraşığı olub. Allah bu cür şəxsləri bizim arvadlara çox görməsin, bunlar kimi "imanı kamillər" olmasaydı, yəqin Gəncə qızlarının yüzdə doxsanı evdə qalardı. Bunun barəsində təfsilat lazım olsa Gəncə arvadlarından bilmək olar, çünki bunun bazarı və kitabları bircə arvadlar arasında rəvacdır. Doğrudur, qızı ərə vermək duasını bundan başqa Molla Hüseynqulu da yazır və bə'zi rəvayətə görə bunun duaları dəxi də mücərrəbdir. Amma bundan Molla Məhəmməd əfəndinin kitabları haqqında mə'lumat sormaq caiz deyil. Çünki bu hərif raqibin yaxşı işini də pisliyəcək. Dostum Dərdmənd, siz şəkililərə bu qisim kitabları çox məsləhət görürəm. Bu kitabın bərəkətindən bankınız da tərəqqə edib, Molla Əlinin qazanı kimi, bir balaca "bankcığaz" da doğar və bu kitablardan bir az çox olsa Şəki yəqin dəxi mütərəqqi olar.

**İmza: Molla Məhəmməd əfəndinin müridi**

## AÇIQ MƏKTUB

**(Gəncədə mamaça Sofiya Markovnaya)**

Ey mənim əzizim və dinayrı bacım Sofiya Markovna. Mən eşidirəm ki, siz özünüzdən bir dərman ixtira eliyibsiniz və Gəncədə müsəlman övrətlərinə xəbər veribsiniz ki, hər kəs o dərmandan alıb yesə, həmişə uşaq doğanda oğlan doğar.

Bu xəbəri mən bir neçə dəfə eşitmişəm və indi genə eşidirəm və eşidəndə də elə adamlardan eşidirəm ki, əgər min dəfə and içsən mən genə inandığıma inanmışam.

Amma doğrusu, dərmanınıza Gəncə övrətlərinin hamısı da şad olsalar, mən eliyə bilmirəm ki, narazı olmuyum. Səbəbi də budur ki, sizin dərmanın on iki il bundan sora çox pis nəticəsi ola bilər. Mən inanıram ki, sizin hünərinizin bərəkətindən dəxi bundan sora Gəncədə bir qız uşağı dünyaya gəlmiyəcək. Amma məgər lazım deyil gələcəyi də bir az fikir eləmək? Bəs bu oğlan uşaqları ki indi dünyaya gəlməklə xoşbəxt olacaqlar, bəs bu oğlan uşaqları on iki il bundan sora evlənmək istiyəndə haradan qız tapacaqlar ki, alsınlar? Söz yox, hərə baş götürüb gedib bir özgə yerdən özünə qız tapacaq, amma mən ondan qorxuram ki, sizin dərmanınızdan özgə şəhərlilər də xəbərdar olalar. Bari aman günüdür, nə eliyirsən elə, barı hünərini dünyaya dağıtma, yoxsa, vallah, müsəlmanların nəslini yer üzündən kəsərsən. Aman günüdür, bizə yazığın gəlsin.

**Cırcırama**

## KÖHNƏ MƏTLƏB

"Tərəqqi"nin 110-cu nömrəsində "Bu misri mərəz bizdən nə vaxt qurtaracaq" sərlövhəli bir mətləb gördüm. Guya baqqal dükanı olan Həsən Əmirqulu oğlu neçə nəfər yoldaşları ilə öz şagirdi Kərim Əbdülqədirovu zornan binamus etmək istiyirmiş.

Genə haman gündə zəngəzurlu Mahmud Hacı Abdulla oğlu həyətdə oynuyan yeddi yaşında Həsən adında bir uşağı...? Belə...

Həsən gəldi, Mahmud getdi, Məhəmməd Hüseyn belə elədi, Məlikyar elə elədi, bunların hamısı öz qaydası ilə. İndi də bir az lüğətdən danışaq.

Hər kəs elmi-tibbdən xəbərdardır. Bilir ki, misri mərəz ona deyərlər ki, məsələn, bir nəfərin gözü ağrıyır, onlara da bu göz ağrısı sirayət edər və genə özgə çox misri naxoşluqlar var. Amma bir də var ki, məsələn, bir anadan, bir atadan nə qədər övlad olursa, elə anadangəlmə kor olurlar. Daha ona misri mərəz deməzlər, ona irsi mərəz deyərlər. Mühərrir əfəndim!!! Tibbdən sərriştən yoxsa, get hələ öyrən. Bunlara irsi mərəz deyərlər. Yə'ni atadan, babadan, cəddi-abadan bu mərəz bizə min ildən bəri irsnən yetişib və nə qədər dünya var, bu miras da var. Məgərinki... Əstəğfürullah, əstəğfürullah. Genə az qalmışdı hicab məsələsi gələ meydana.

**Qızdırmalı**

## HACI OĞLU

Bu may ayının 15-də imtahanlardan sora "Firiduni məktəbi"ndə bir məclis (akt) təşkil olunmuş idi. Müəllimlərin bir neçəsi çıxıb nitqlər söylədilər və bu məktəbdə 3-cü sinifdə bir şagird var ki, uşkolda əvvəlinci nadinc və bədxasiyyət və dərsə meyl etmiyən hesab olunur. Əlbəttə, bu il bu uşaq imtahan vermədiyinə görə qaldı 3-cü sinifdə və dördə keç-

mədi. Akt günü bunun dayısı Məhəmməd Əli oğlu nam atası Hacı Əbdül nam ilə bahəm uşkola gəlib bir yekə dava saldı və dedi ki, bu uşkol camaat uşkoludur. Müəllimlərin ixtiyarları yoxdur mənim həmşirəzadəmi ki, Hacı oğlu olsun, 3-cü sinifdə saxlasınlar və hər tövr olsa gərək bu keçsin 5-ci sinfə və çox naqabil və həmişə müsəlmandan eşidilən sözlərdən sora uşağın əlindən tutub, a gədə, gəl səni aparıb gimnaziyaya qoyacağam, - deyə uşkoldan çıxdı.

Genə bu il Cəlil nam gedib polisiyaya şikayət edir ki, müəllim M.Ç. uşağımı elə vurub ki, ölür. Polisadan bir piyan qaradovoy gəlib uşkoldan dərsdən müəllimi çəkib aparır polisiyaya, sora mə'lum olur ki, uşkolda heç belə iş ittifaq düşmüyüb. Cəlil uşkolun bərpa olunmağına qəsd edən adamlardan biri olduğuna görə bu işi iftira edir ki, müəllim biabır olsun. Yə'ni bunun bir o qədər eybi yoxdur, çünki Cəlil bu işləri zarafat babətindən edirmiş, nəinki qəsdnən.

"Müzəffəri məktəbi" çoxdan danosların bərəkətindən qapandı və qazi Mir İbrahim ağa cənabların da allahın rəhmətinə getdi.

Vəssalam.

**Xəbərçi**

---

## *FELYETON*

### MOZALAN BƏYİN SƏYAHƏTNAMƏSİ

Ordubad bir dənə pak və müqəddəs şəhərdir. Küçədə heç bir kəsi görməzsən ki, əlində təsbeh olmasın. Əhalinin çoxu molla və seyiddir. İl on iki ay məscidlərdən mərsiyə səsi gəlir.

Xüsusən bu il mollaların ilidir, necə ki deyərlər, bu il gilasın yainki üzümün ilidir. Sözüm burasındadır ki, Ordubadda dörd ildə bir dəfə molla və seyidlərin hörməti çox artıq olar. Bunun səbəbi budur ki, Ordubadda dörd ildə bir dəfə şəhər üçün qlava seçirlər və qlavalıq məşqində olanlar hər bir işlərini ötürüb başlarlar molla və seyidlərə qulluq eləməyə, çünki qlavalıq ixtiyarı mollalarda və seyidlərdədir. Hər kəsi ki bunlar təsdiq elədi o seçiləcək. Bir iş molla və seyidsiz baş tuta bilməz. İndi bu saat Ordubadın ixtiyarı seyid Mürtəza ilə Ağ Seyidin oğlundadır. Hər kəsi ki bunlar təkfir elədi, dəxi o adam şəhərdə baş gəzdirə bilməz. Məsələn, ağaların fitvası ilə şəhərimizin qəzetə oxuyanlarını baykot ediblər, bir kəsin hünəri deyil ki, gedib poçtadan qəzetəsini alsın oxusun.

Bəli, sözüm qlavalıqdan düşmüşdü. Bu günlərdə bir qərib adam Ordubada gəlsə, öz gözü ilə görər ki, bir dəstə əmmaməli, yə'ni seyid və molla küçə ilə gedirlər. Uzaqdan görürsən ki, bunların qabağına bir nəfər ağa çıxdı ki, özlüyündə çox mö'təbər və nüfuzlu bir adamdır. Uzaqdan molla dəstəsini görən kimi haman ağa iki əlini döşünə qoyub ucadan salam verir. Nabələd adam ola bilər ki, buna təəccüb eləsin, çünki əhvalatdan xəbərdar deyil. Amma axırda mə'lum olur ki, haman cənab qlavalıq şövqündədir və mollalara hörmət qoymağı məhz politika ucundandır, nəinki ürəkdən. Bir-iki ay olar - buranın seyidləri və mollaları bir gün olmuyub ki, öz evlərində çörək yesinlər. Yə'ni özgə vaxtlar da öz çörəklərini yeməzlər. Amma söz burasındadır ki, bu bir-iki ayı həmişə hər axşam cücəplov yeyirlər və gecə və gündüz qlavalıq dəstgahını icad eliyənlərə rəhmət oxuyurlar.

Burada bir təzə xəbər deyim. Bir neçə həftə bundan irəli mədrəsə həyətində mollalar və tələbələr yüngülvari savaşdılar, yə'ni hərəsi əlinə bir dəyənək götürüb bir-birinin kəlləsini bir az əzdilər. Axırda qaradavoy gəldi,bunları apardı polisaya və sora ötürdülər.

......................

Əhalinin əhvalını xəbər alsan, bunu deyə bilərəm ki, işlər yaxşıdır, yaman deyil. Hərçənd bir yanda məktəb-zad söhbəti yoxdur, amma mö'minlərin duasının bərəkətindən yaxşı ötüşürlər, çünki azdan-çoxdan allah göndərəndən yeyib allahın suyunu içirlər və bir növ yaşıyırlar və mən elə qanıram ki, dəxi bir özgə şey də heç lazım deyil.

......................

Dünən getmişdim yavuqluqda olan Əylis deyilən erməni kəndinə. Nələr gördüm? Axmaqlar deyəsən dəli-divanə olublar. Əvvəl onu deyim ki, bu kənd elə bil ki, Tiflisin bir məhəlləsidir. Gözəl imarətlər, təmiz küçələr, neçə-neçə böyük körpülər, neçə-neçə pakizə məktəblər, qiraətxanalar və maarifə dair hər bir qisim tikili və dəstgahlar. Vallahı ki, lap quruyub qaldım. Camaatı da ki heç tanımaq olmur; guya ki, Firəngistandan bu saat gəliblər: libasları, hərəkətləri, təmizlikləri (təmizlik deyəndə zahiri təmizliyi deyirəm, fikriniz özgə yana getməsin). Xülasə, məəttəl qaldım.

Əylisdən Ordubada qayıdıb gördüm ki, genə bir evdə mərsiyə oxunur və müsəlmanlar genə ağlıyır. İstədim deyəm ki, ay balam, bu qədər niyə ağlıyırsınız? Yoxsa indidən bunu duymusunuz ki, qonşularınız maarifin silahı ilə silahlanıb yavaş-yavaş gəlib sizi buralardan tökəcəklər eşiyə və mal-mülkünüzə də sahiblənib sizi evlərində nökər yerində işlədəcəklər.

Heç kəs deməsin ki, belə olmaz. Dünyanın keçəcəyinə və mədəniyyətin tarixinə hər kəs bir az diqqət eləsə, görər ki, həmişə işlərin axırı belə olub.

Sora bəlkə genə yazam.

**Məşədi Mozalan bəy**

---

## *POÇTA QUTUSU*

......................

Gəncədə Kazım bəy Mirzoyev cənablarına: Arxayın olun ki, 12-ci nömrədə yazdığımız "Veyil Kazım" siz deyilsiniz.

Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə.

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə Varansovski-Vrangelski küçələrin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

Jurnalın hər bir nüsxəsinin qiyməti Ələkbərovun dükanında 12 qəpikdir.

E'lan və abunə qəbul etmək üçün də vəkilimiz həmin Məşədi Əyyub Ələkbərovdur.

## E'LAN

1. "Hesab məsələsi" (Задачник). Bu kitab məktəblərdə və evlərdə hesab tə'limi üçün tərtib olunub, 761 hesab məsələsini, 237 tə'limati-rəqəmiyyəyi və Rusiyada iste'mal olunan ölçüləri və ölçülərə dair tə'limləri havidir. Qiyməti 35 qəpikdir.

2. Gündəlik dərsləri yazmaq üçün yövmiyyə dəftəri (Дневник).

Şagirdlərə gündəlik, həftəlik, aylıq və illik nömrələr qoymaq və dərsləri yazmaq üçün cədvəlləri və bə'zi digər mə'lumatı havidir. Qiyməti 30 qəpik.

Bu kitabları almaq istəyən müəllimlərə və kitabçılara böyük təfavüt qoyulacaqdır. On ədəddən əskiyinə poçta markaları qəbul olunur. Xahiş edənlərə naloj ilə göndərilir.

Adres: Gəncədə Həmidbəy Yusifbəyova.

Новая книга Атрпеть Мамедь Али Шахъ. Современная Персия. Продается въ Тифлисе. Книжная торговля, Гуттенбергъ: Александрополь, типография Ширакъ, Цена 1руб., съ пересылкой.

Rus dilində təzə kitab, yazan: Atrpet. Məhəmmədəli şah (İranın indiki halı). Satılır: Tiflisdə Quttenberq kitabxanasında və Aleksandropolda "Şirak" mətbəəsində. Qiyməti poçta xərci ilə bir manatdır.





Peterburqda "Mexaniçeski" şirkətinin çox ə'la ayaqqabıları.

Rantavoy tikilmiş və vintli, hər fasonda. Hər bir böyük mağazada satılır.



Əsl malların üstündə belə bir nişan var. Rus-Amerika rezin manufakturasının şirkəti Firması "Triuqolnik"

(Üçguşəli)

ПОДЪ ТРЕУГОЛЬНИКЪ ФИРМОЙ

Haman yerdə dəri skladı və bə'zi zaqraniçni mallar və Rus-Amerika rezin qaloşları manufakturasının Peterburqun "Mexaniçeski" şirkətinin ayaqqabılarından ötrü "krima" və "apritura".

| İDARƏMIZDƏ SATILAN KITABLAR | | | |
|---|---|---|---|
| Kitabların adları | Yazanlar | Qiymətləri | |
| | | idarədə | poçta xərcilə |
| Dərs kitabları: | | | |
| Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dəsr kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dəsr kitabı | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: | | | |
| Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəi-tərəqqi (farsca) | -*--*--*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıb-zadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*--*--*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*--*--*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüs-şəriə (birinci hissə) | -*--*--*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüs-şəriə (ikinci hissə) | -*--*--*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıb-zadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*--*--*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbəy Cavanşir (milli şe'r məcmuəsi) | -*--*--*- | 25 qəp. | 30 qəp. |

*Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik. Naləjmi vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.*



## *E' L A N*

"Söhbət basərrəfiqəm və ya naleyi-qəribaneyi-Neyyir" açıq və şirin fars dilində yazılmış 63 səhifədən ibarət olan həmin kitab 25 bənd nəzm ilə vətənin halı yolunda nalə edir. Bu kitab "Qeyrət" mətbəəsində təzə çapdan çıxıb mövqeyi intişarə qoyuldu. Qiyməti 40 qəpik.

Xahiş edənlər bu adresə rücu' etsinlər: Tiflisdə, altıncı hissədə, Botaniçeski küçədə, 9 nömrəli evdə, şair Neyyir cənablarına, yainki "Molla Nəsrəddin" idarəsinə.

Həmin şairin "Mir'ati-vətən" adlı təzə çapdan çıxmış kitabı yenə satılmaqdadır. Qiyməti 10 qəpik. Xahiş edənlər həmin adresə rücu' etsinlər.

## *E' L A N*

Kitabxanamızda hər cür məktəbə və maarifə dair kitablar mövcuddur. Kitabi-Təşrihəl-Fəraiz, Risaleyi-zibdətül-əhkam, Ümdətül-əhkam, Əcəm dili, Uşaq bağçası, Nəsihətül-ətfal, Tərcümeyi-tövfeyi-Nəsuhiyyə və Təfsirəl-Qur'an əsəri Mollazadə və Təbrizin xəritəsi 60 qəpiyə və kitab Tacül-təvarix əmiri-əfğan Hacı Ələsgər Məmmədzadeyi-kitab-

# "Молла Насреддинъ"

*КОНТОРА и РЕДАКЦІЯ*
журнала
"Молла Насреддинъ"
Тифлисъ
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКІЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу...................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНІЯ*
*За место занимаемое строкою петита впереди текста .....10 коп.*
*позади * * * .....7 коп.*



Ax, Vilhelm, Vilhelm, haradasan?
Где ты, о Вильгелмь, Вильгелмь!!.

Mənim qulaqlarım eşitmir.
Я ничего не слышу



Təzə məktəblərimizin vücudu ilə inşallah, bəlkə biz
də gözümüzü açıb tərəqqi edək.

1909 г. دوردنجی ایل ۱۹۰۹

# ملا نصر الدین

№ 23 Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپیک ۲۳




Şahtaxtından məktub: Bizim Molla Nəcəfül-əşrəfdə Ümumilyəhyayi-şəriə, fiqhiyyə, üsuli-hökmiyyə, coğrafiya, hesabiyyə, tarixiyyə, tibbiyyə və dünyanın hamı elmlərini mükəmməl bir surətdə təhsil eliyib: Əhməd Qazizadə, Molla Nəsrəddin: Əgər bu

Şəriətmədar: A sənin görüm qəbrin od ilə dolsun.
Sən ölməsəydin bu otuz tüməni səndən alacaq
idilər, indi səni tapmıyıb yapışdılar yaxamdan, pulları məndən aldılar. (Rəştdə)

**ABUNƏ QİYMƏTİ**
Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д. 24.*

Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

E'lan qiyməti

Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

**I cəmadiyəl-axər 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 7 iyun 1909**

**"Molla Nəsrəddin"in əvvəlinci, ikinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 5 manat, ikinci və üçüncü ili 6 manat, boş cildi 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili 6 manat, ikinci və üçüncü ili 7 manat, boş cildi 1 manat.**



## SATIRAM

Moldayı, salmadı el dil
boğaza...
Eybi yox gərçi qoyulduq
loğaza,
Yaz bu e'lanımı da bir kağaza,
Açmışam Reydə geniş bir
mağaza.
Çox ucuz qiymətə hər şey
satıram,
Ay alan... Məmləkəti-Rey
satıram.

Mağazamda tapılır hər
cürə zad,
Cami-cəm, rə'yyəti-Key,
təxti-Qubad.
Gərçi bazarımı etməkdə
kəsad,
Sə'y edir bir para İraninəjad.
Leyk mən baxmıyıram,
hey satıram,
Ay alan!.. Məmləkəti-Rey
satıram.

Nə gərəkdir mənə bir
bunca ümur
Ki, edə qəlbimi bihissü hüzur?
Babama vermədi əl Abəki-şur,
Deyiləm naxələfü nabeşüur.
Qəsri-Şirin, əsəri-Key satıram,
Ay alan!.. Məmləkəti-Rey
satıram.

İstəməm nuru, qaranlıq
sevirəm,
Mülki-İranı dumanlıq sevirəm.
Boşluyub şəhri, yabanlıq
sevirəm,
Bəsdi şahlıq, dəxi xanlıq
sevirəm.
Səbzəvar ilə Miyamey satıram,
Ay alan!.. Məmləkəti-Rey
satıram.



Söz mənim, ev mənim,
əsrar mənim,
İrzü namus mənim, ar mənim,
Mal mənim, məsləhəti-kar
mənim,
Satıram dövləti -
Qacar mənim.
Kimə nə dəxli ki mən şey
satıram?
Ay alan!.. Məmləkəti-Rey
satıram.



Şahi-məşrutəpənah olmaq isə,
El qoyan vəz' ilə şah
olmaq isə,
Guş bərəmri-süpah olmaq isə,
Şah olub həmdəmi-ah
olmaq isə,
Xan olub nuş eləyib,
mey satıram,
Ay alan!.. Məmləkəti-Rey
satıram.



**Əbunəsr Şeybani**

## QƏRİBƏ ƏHVALAT

Bu günlərdə Ağdamda Kərbəlayı Qəhrəman adında bir adam yox olur və hökumət nə qədər sə'y eliyir ki, axtarıb tapsın, tapa bilmir.

Bu gün Ağdamdan teleqraf ilə bizə xəbər verdilər ki, haman adam tapıldı. Belə mə'lum olur ki, Kərbəlayı Qəhrəman Ağdam hamamında hovuzun kənarında oturub əl-üzünü yuyurmuş və birdən hovuzun içinə bərk tükürəndə özünü saxlaya bilmiyib düşüb hovuzun içinə. Sora su daşıyanlar gəlib hovuzdan başlıyıblar çayxanalara samavara tökməyə su aparsınlar, deməgilən suya düşən adamın ölüsü düşüb tuluğun içinə və gedib çıxıb çayxanaların birinə.

Xülasə, əhvalat bu qərar iledir. Olan olub, keçən keçib.

Allah Kərbəlayı Qəhrəmana rəhmət eləsin və qohum-əqrabasına səbir versin. "İnna lillah və inna ileyhi raciun". Amma Ağdam camaatına da bu keyfiyyət gərək dərs olsun. İnsan gərək ehtiyatı əldən qoymasın. Barı bundan sora Ağdam hamamının hovuzunda əl-üzlərini yuyanlar hovuza tükürəndə bərk otursunlar, yoxsa boğulub ölməkləri qalsın kənarda, axırda meyitləri gedib düşər çayçı samavarına və bişib axırda cəhənnəmə vasil olar.

**Cırcırama**

## XƏBƏR

Molla dayı, bax verirəm
mən xəbər:
Eyləməyə işləri zirü zəbər.
Etdi genə Gəncəyə ağa səfər
Tutmaz işin, pis görürəm
halını,
Qırmıyalar, gözlə pərü balını.

Gəncəyə gəl, bircə bu
ağaya bax,
Tazə gətirmiş neçə
fitvaya bax,
Anla sözüm, mətləbə,
fəhvaya bax.
Tutmaz işin, pis görürəm
halını,
Qırmıyalar, gözlə pərü balını.

Gəlmiş idi Gəncəyə
bundan qabaq,
Gərçi deyildi o zaman bu
sayaq,
İşlərin etmişdi tamam
baş-ayaq,
Tutmaz işin, pis görürəm
halını,
Qırmıyalar, gözlə pərü balını.

İndi gəlib ayrıca təqrir ilən,
Yüz minədək nameyi-
təkfir ilən,
Kimsə bacarmaz bu bizim
mir ilən.
Tutmaz işin, pis görürəm
halını,
Pis görürəm halını, əhvalını.

Mətləbi lazımdı edəm ixtisar,
Lə'nətü təkfir gəlib bişümar,
İndi dəxi dinmə, əmi, et qərar.
Tutmaz işin, pis görürəm
halını,
Yolmıyalar, gözlə ki, saqqalını.

**Gəncə şairi**

## İKİ NƏFƏR

Möhtərəm Molla əmi, bizim Petrovskdə bir nəfər Mirzə İbrahimov var, bir də bir Əminbəyov. Bunların əlindən lap təngə gəlmişik. Bilmirik nə eliyək, kimə şikayətə gedək. Bir-iki ildir ki, bura gəliblər, nə qədər adamı yoldan çıxardıblar, indi az qalır ki, bu gün-sabah rəisləri də yoldan çıxartsınlar, mö'min əli təsbehli hacılarımızı da yoldan çıxartsınlar. Hər gün cürbəcür qəzetə-jurnal gətirdib ciblərindən uşaqlara pul verib qəzetə satdırırlar, biz də yavaş-yavaş bilmiyib oxumuşuq. İndi başa düşmüşük, dəxi nə alırıq, nə də oxuruq. Bu zalım uşağı zalım, bizi lap darıxdırıblar. Danos verdik, olmadı. Şeytanladıq, olmadı. Onlar ilə ülfətimizi kəsdik, olmadı. Tiryakilər təkfir elədilər, olmadı. Qumarbazlar təkfir elədilər, olmadı. Oğrular, keyflilər, bikarlar, axundlar təkfir elədilər, olmadı. İndi hər yerdən ümidimiz kəsilib, bircə ümidimiz sənə gəlir, dua ilə, tilsim ilədir, yoxsa cadu ilə dil-ağız bağlamağnandı, iki nəfərin şərini bizim başımızdan eləgilən. Səni and verirəm köhnələrin sənə olan hörmətinə, heç yadınızdan çıxartmıyın, bizim dərdimizə çarə ediniz.

**Təzə**

## FİR'ON TƏPƏSİ

Dörd mil il keçdi getdi, amma guya ki, dünyada heç bir şey dəyişilmiyib.

Dörd min il bundan irəli Misirdə fir'onların keyfi gələndə hökm edərdi ki, rəiyyət işləsin. Neçə milyon fəhləni yumruq gücü ilə salardılar işə. İşlərdilər, işlərdilər, on il işlərdilər, yüz il işlərdilər, torpağı torpaq üstə qalardılar - axırda olardı bir uca təpə, elə uca olardı ki, hacılarımızın papağından da uca olardı.

İndi Şamaxıda Şeyx Həmid paşanın imarət tikdirməyini görəndə fir'on Musa yada düşür. İndi Şamaxıya hər kəsin yolu düşsə, görər ki, kəndlilər qarışqa kimi tökülüb işliyirlər və axşam olan kimi gedib Həmid paşanın xəlifəsi Hacı Məhəmmədin əlini öpüb ac-susuz qoyub gedirlər evlərinə. Övrətləri soruşanda ki, "ay kişi, bu gün nə qazanıbsan?" Cavab verirlər ki, "arvad, dinmə, Həmid paşadan behiştə izin almışam".

Dörd min il gəldi keçdi, amma deyəsən ki, dünən idi.

**Məşədi Qasım**

## QƏZETƏLƏRDƏN

"Bəyanül-həqq" qəzetəsinin müxbiri Molla Əbdürrəşid İbrahimov Yaponiyanın Tokio şəhərindən İstambulda çıxan "Siratül-müstəqim" məcmuəsinə yazır ki, "Mən Yaponiyada hər məclisdə hər gün nitqlər söylüyürəm və Yaponiya üləmasına mənim nitqlərim elə tə'sir bağışlayır ki, gündə bir neçəsi özündən gedir.

Bu xəbəri möhtərəm "Tərcüman" qəzetəsi yazıb, axırda soruşur ki, ayə, görən Molla Əbdürrəşid bu nitqləri ingilis dilində söylüyür, yainki yapon dilində?

Biz lazım bilirik bu barədə "Tərcüman"a ərz edək ki, doğrudur, Molla Əbdürrəşid nə ingiliscə bilir, nə yaponca və nə firəngcə və bu da aşkardır ki, bu üç dilin heç olmasa birini də bilmiyən Yaponiya məclislərində hər nə danışsa, qulaq verənlərin qulaqları taqqıldıyacaq.

Lakin Molla Əbdürrəşidin əhvalatı özgədir. Bu cənab niqtlərini türk dilində söylüyür və yaponiyalılara da mollanın nitqinin məzmununu bilmək lazım deyil, onlara Molla Əbdürrəşidin məhz uzun saqqalı və ağ əmmaməsi xoş gəlir. Səbəbi du budur ki, Yaponiya camaatı mö'min adamlardır və müsəlmançılığa da çox maildirlər. Və hətta Molla Əbdürrəşidi o mərtəbədə xoşluyublar ki, "Bəyənül-həqq" qəzetəsinin yazmağına görə, Əbdürrəşidin haman qəzetədə yazdığı nömrələri yaponiyalılar baha qiymətə gətirdib ibadətxanalarında saxlıyırlar.

Hər kəs bizim sözümüzə inanmasa, "Bəyanül-həqq" qəzetəsinin 26 martda çıxan 447-ci nömrəsini tapıb oxusun.

Bircə sözümüz qaldı.

Molla Əbdürrəşid İbrahimov bunu bilir ki, Yaponiyadan yazdığı məktubları müsəlmanlar oxuyur, nəinki qeyr bir millət. Müsəlmanlara da nə yazsan, keçib gedər, ürəyini sıxma...

**Lağlağı**

## ŞƏKİL

Əgər izin olsa, gələn həftə məcmuəmizdə bir belə şəkil çəkiləcək.

Nuxada bir adam vəfat eliyib və o günü də məhəllə mollası Hacı İsmayıl əfəndi şəhərdə olmadığına görə Gileyli məhəlləsinin mollası Əhməd əfəndidən təvəqqə edirlər və bu da gəlib ölünü götürür.

Küçədə cənazəni qəbiristana aparan yerdə aha, birdən naqafil Hacı İsmayıl əfəndi rast gəlir. Kimdir vəfat edən? Bəli, filankəsdir. Kim bunun namazını qıldı? Bəli, Molla Əhməd əfəndi. O necə bu cür'əti elədi? Bəli, axund, bağışlıyınız, çünki sizin təşrifiniz burada deyil idi, ölü də qalırdı yerdə.

Çox əcəb.

Bir neçə gündən sora eşitdik ki, biçarə Molla Əhməd əfəndinin üstünə hökumətə danos verilib.

Əgər Hacı İsmayıl əfəndi izin versə, bu əhvalatın şəklini gələn nömrədə çəkərik, verməsə çəkmənik.

## ÜSULİ-CƏDİD

Bu üsuli-cədid çox qəribə şeydir. Əvvəllər uşağı bir il oxudardılar, yazıb-oxumaq bilməz idi. Amma indi iki-üç ayın içində basavad olur.

Nuxada bu üsuli-cədidin tərəqqisi daxi də artıqdır. Məsələn, keçən həftə Salahlı kəndindən iki ayağı çarıqlı, bisavad kəndli gəlmişdilər Nuxaya ki, bir həftənin içində "üsuli-cədid" vasitəsi ilə mollalığa imtahan tutub şəhadətnamə alıb getsinlər.

Öz yanlarınca ehtiyat üçün yaxşı Salahlı xəliçələri də gətirmişdilər. Çünki "üsuli-cədid" üçün xəliçələr lazımlı bir şeydirlir.

Elə o cür də oldu. Nurməhəmməd əfəndi bu kəndliləri bir həftənin içində molla eliyib yola saldı. Amma yazıqlar bir şeydə səhv elədilər ki, yanlarınca gətirdikləri pulları "üsuli-cədid"in üstünə qoydular və yola düşmək istiyəndə gördülər ki, faytonçu pul istiyir.

Axırda bazara düşüb bir-iki manat allah bəndələrindən borc eliyib çıxıb getdilər.

Amma kişilər necə ki lazımdır, "alim" oldular. Sağ olsun "üsuli-cədid".

**Dəli**

## KAL YEMİŞ

Raviyani-əxbar və naqilani-asar tutiyi-xoşgüftar gözəl şəhərdir Car (hə, Molla əmi, deyəsən şe'r oldu). Belə rəvayət edirlər ki, musullu Abdulla Mustafa oğlu sağlığında öz mülkündən bir qit'ə yer məscidə vəqf və bir qədər əmlak bir varisinə nəzir eləmişdi. Bir müddət keçəndən sora Abdulla nam mərhum olur. Bunun bir qeyr varisi gəlib qazi Seyidovu görür. Seyidov da bunu görür və bu Seyidovdan bir nəzir kağızı alır, ermənilərin dəftər hesabı nisyələrini agent Molla Məhəmməd şeyx oğlu Qarasu müsəlmanlarından qaçaq hədəsilə zornan alan kimi... "Hə, mətləb bizdən uzaq düşdü. Müxtəsər, bu nəzir kağızını nahiyə qazisi imzalıyıb göndərir Tiflisə Müfti cənablarına. Müfti cənabları da görür ki, bu nəzir kağızı qazinin saxta bostanından üzülmüş bir yemişdir, ancaq... çox kaldır. Qazinin dişləri qamaşmasın deyə, bu kağızı Müfti cənabları dərhal dala qaytarıb bunun şəriətə müvafiq və həqiqətə mütabiq surətdə həll olunmasını qazilərə tövsiyə edirsə də, cənab qazi kömür ağdır deyə durur... Xülasə, bu zikr olunan nəzir kağızı uşaq oyunu kimi iki dəfə Tiflisə gedib genə təzədən baxılmağa Cara qayıdıbdır. İndi isə "Koroğlu üçə kimi" məsələsinin mövcibincə qazi üçüncü dəfə olaraq genə o kağızın əvvəlki ha-

lında qalmasını xahiş edir. Müfti cənabları şəriət və millət xatirəsi üçün car müsəlmanlarının nahiyə qazisinin əlindən alınmasına bir iqdam eləsə, çox böyük yadigar qoymuş olur...

**Sofi zənbil**

## *TELEQRAF XƏBƏRLƏRİ*

.....................

**Şamaxı.** Bura ə'yanları kosa Hacı İbrahimovun rəyasətilə bir şura edib, belə qərar qoydular ki, Peterburqda padşahlıq Dumaya və İstambulda məclisi-məb'usana teleqram edib mə'lum etsinlər ki, Şamaxı əhli səltənətə Əbdülhəmiddən qeyri padşah qəbul etməzlər. Şamaxı əhlinin bu qərardadına ağdaşlılar və nuxalılar da iştirak edirlər.

.....................

**Peterburq.** Burada dövlət tərəfindən məscid tikilməyə izin verilmədiyi üçün müsəlmanlar dövlətdən küsüb indi acıqnan haman yerdə məscid əvəzinə bir darülfünun tikdirirlər.

.....................

**Daşkənd.** Türküstan ehtiyacatın təftişə gələn cənab nitqində dedi ki, dini nə ehtiyacınız varsa, buyurun. Amma indidən deyirəm: dünya ehtiyacı barəsində mənə üz vurmuyun. Cavabında müsəlmanlar dedilər ki, onsuz da bizim dünyaya ehtiyacımız yoxdur.

**"Əddünya ciyfətün talibü həlkilabü".**

.....................

**Vladiqafqaz.** Məscid mədrəsəsi axundun duasının bərəkətindən aləmi-fənadan aləmi-bəqaya rehlət edir. Novruz mədrəsəsi balaca bacısının ayrılığına tab gətirə bilmiyib, köhnə mərəzi şiddətlənib, düşüb bəstəri-həlakətə. Həkimlər alma qızarana vaxt qoyublar.

## *DÜYÜN*

Üqdeyi-şirvaniyan, həll
şüd əz rəmli-tas,
Tas məgu ey əmu, dami-hiyəl
bə bəhri-nas.

Yə'ni Tehrandan Şirvana Hacı Rəhmətullah adında bir rəml atan ikiayaqlı zəli gəlib adamların qanın rəml atmaq, dua yazmaq bəhanəsilə iyirmi beş manata, on beş manata sorur, nə əskik qiymətə. Amma çifayda, kəsrəti-xəyalından gönlərin qalınlaşmağına görə heyvan zəlinin sormağın başa düşmürlər. Bununla belə, hər kəsdən xəbər alsan lotu Hacı Rəhmətullahı əhli-qeyb və ürək düyünü açar deyirlər. İnşallah, sağlıq olsun gedəndən sora mə'lum olar, görək bu adam ürək düyünü açandı, yoxsa pul düyünü. Xülasə, allah belə vücudu arif şirvanlılara çox görməsin və amin deyən dillər lal olmasın.

**Qırxayaq**

**İdarədən:** Müsəlman qardaşlar Hacı Rəhmətullahı axtarmaq istəsələr, bu adresə rücu'etsinlər:

**Hacı Şeyxi oğlu Ağa Ələsgərin evində**

## *GƏNCƏDƏN*

Ayın iyirmi dördündə müsəlmanların təvəqqeyinə görə cənab qubernator öz xanımı və digər xanımların köməyi ilə şəhər bağında müsəlman nəşri-maarif və dram məclisinin mənfəətinə bir seyri-ümumi düzəltmişlərdir. Bağ ruslar və kasıb-kusub müsəlman ilə dolu, amma - intelligent, rüəsa və tüccar qismindən bir fərd dəxi yox idi. Hərgah nümunə üçün bağda olan camaat hərə əlində bir zərrəbin bütün bağı, kol-kosu bir-bir arayıb bir rəis, ya bir intelligent axtarsaydı, yəqin ki, Mə'dəlidə bir insaniyyətlik tapmağı bağda intelligent tapmaqdan asanraq bilərdi. Doğrudur, bizim intelligentlər ittifaq etmişlərdir ki, bağ seyrinə gəlsinlər, amma... səhvən bağ seyri əvəzinə dağ seyrinə getmişlər... Allah müsəlmanların boylə ittifaqını gözdən, nəzərdən saxlasın... Həqiqətən, vəqta ki işin başında qubernator və onun xanımıdır. Aşkardır ki, müsəlmanlar gəlməsə də iş aşacaq, rus, erməni və kasıb-kusub müsəlmanlar gəlib pul verəcəklər, müsəlmanların oxumuşlarına, xan və bəylərinə artıq zəhmət bicadır...

**İmza: Kolagirən**

## *POÇTA QUTUSU*

.....................

Gorusda bir nəfər "Zəngəzurlu"ya: Yazırsınız ki, qazi Mir Fəttah ağa özgə müsəlman qəzetələrinə müştəri yığır, amma "Molla Nəsrəddin"i haram deyib qoymur camaat alıb oxusun.

Əgər həqiqətdə qazi Mir Fəttah ağa müsəlman qəzetələrinə müştəri yığır, - biz hər halda qazi cənablarından razıyıq.

.....................

Aşqabadda "Qara toyuğ"a: Şe'riniz çap olunmuyacaq.

Bakıda "Hacı oğlu"na: Görükür ki, Bakının istisi əhvalınızı xarab eliyir: Məsləhət budur ki, gedəsiniz yaylağa, bəlkə o vaxt şairlik təb'iniz gələ.

Müdir və baş mühərrik:
Cəlil Məmmədquluzadə.

## E' L A N

Bə'zi əşxas idarəmizə məqalə göndərəndə kağızın içinə marka qoyur və yazır ki, məqalə çap olmuyan surətdə geri göndərmək.

Biz qəti cavab veririk ki, idarəmizə göndərilən məqalələri dübarə sahibinə göndərməyə vaxtımız yoxdur və hətta kağız içində göndərilən markalar da sahiblərinə qaytarılmıyacaq.

"Molla Nəsrəddin" idarəsi

## BÖYÜK TAMAŞA

Bu gün, yə'ni iyun ayının 7-də bazar günü Müctəhid bağında camaat darülfünunu mənfəətinə böyük bir "qulyaniya", yə'ni ümumi seyr düzələcək. Müsəlman camaatı gərək nəzərdə tutsunlar ki, camaat darülfünunu xərci ilə Vira məhəllәsində müsəlman kişiləri üçün axşam məktəbi davam edir və müsəlmanlar bu gün haman seyrə gedib az-çox mənfəət verməkdən gərək uzaq durmasınlar.

## MÜSƏLMAN TEATRI

Tək günü, iyunun 9-da cənab Ərəblinskinin teatr dəstəsi tərəfindən Tiflisdə Artistiçeski teatrda məşhur "Yəhudilər" faciəsi mövqeyi-tamaşaya qoyulacaq. Bu faciə Rusiya teatrlarından artıq hörmət qazanıb. Faciənin mütərcimi məşhur faciənəvisimiz Haqverdiyev cənablarıdır.









Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə Varansovski-Vrangelski küçələrin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

Jurnalın hər bir nüsxəsinin qiyməti Ələkbərovun dükanında 12 qəpikdir.

E'lan və abunə qəbul etmək üçün də vəkilimiz həmin Məşədi Əyyub Ələkbərovdur.

| İDARƏMIZDƏ SATILAN KITABLAR | | | |
|---|---|---|---|
| Kitabların adları | Yazanlar | Qiymətləri | |
| | | idarədə | poçta xərcilə |
| Dərs kitabları: | | | |
| Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dərs kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dərs kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dərs kitabı | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: | | | |
| Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəi-tərəqqi (farsca) | -*--*--*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıb-zadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*--*--*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*--*--*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*--*--*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*--*--*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıb-zadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*--*--*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbəy Cavanşir (milli şe'r məcmuəsi) | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Hesab məsələsi | Həmidbəy Yusifbəyov | 35 qəp. | 41 qəp. |
| Söhbət basəri-rəfiqəm | Şair Neyyir | 40 qəp. | 40 qəp. |
| Mir'ati-vətən | -*--*--*- | 10 qəp. | 10 qəp. |
| Vətən və hürriyyət | Səid Ordubadi | 7 qəp. | 7 qəp. |
| Azadə danışmaq | Volgenşteyn | 5 qəp. | 5 qəp. |
| Qəflət | Səid Ordubadi | 10 qəp. | 10 qəp. |

***Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik. Nalojnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.***

## E'LAN

"Söhbət basəri-rəfiqəm və ya Naleyi-qəribaneyi-Heyyir". Açıq və şirin fars dilində yazılmış 63 səhifədən ibarət olan həmin kitab 25 bənd nəzm ilə vətənin halı yolunda nalə edir. Bu kitab "Qeyrət" mətbəəsində təzə çapdan çıxıb mövqeyi-intişara qoyuldu. Qiyməti 40 qəpik.

Xahiş edənlər bu adresə rücu etsinlər: Tiflisdə, altıncı hissədə, Botaniçeski küçədə, 9 nömrəli evdə, şair Neyyir cənablarına, yainki "Molla Nəsrəddin" idarəsinə.

Həmin şairin "Mir'ati-vətən" adlı təzə çapdan çıxmış kitabı genə satılmaqdadır. Qiyməti 10 qəpik. Xahiş edənlər həmin adresə rücu' etsinlər.

## E'LAN

Kitabxanamızda hər cür məktəbə və maarifə dair kitablar mövcuddur. Kitab Təşrihül-fəraiz, Risaleyi-zübdətül-əhkam, Ümdətül-əhkam, Əcəm dili, Uşaq bağçası, Nəsihətül-ətfal, Tərcümeyi-töhfeyi-Nəsuhiyyə və Təfsirül-Qur'an əsəri Mövlazadə və Təbrizin xəritəsi 60 qəpiyə və kitab Tacüt-təvarix əmiri-əfğan Hacı Ələsğər Məhəmmədzadeyi-kitabfüruş dükanında satılır.

# "Молла Насрединъ"

КОНТОРА и РЕДАКЦIЯ
журнала
"Молла Насрединъ"
Тифлисъ
Давидовская ул., д.24

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКIЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

ЦѢНА на ГОДЪ
Съ доставкою..............5 руб.
За границу....................6 руб.
ЦѢНА за ОБЪЯВЛЕНIЯ
За место занимаемое строкою
петита впереди текста .....10 коп.
позади * * * .....7 коп.




Gəncədə müsəlman Nəşri-maarif cəmiyyəti
mənfəətinə düzələn seyri-ümumi
Bəs harada qalıblar müsəlmanlar!..

Ermənilərin "Akulisi" kəndi

Müsəlmanların "Ordubad" şəhəri

Allah-taala insanı bir cür yaradıb, lakin məl"un şeytan xalqı aldadıb hərəni bir yola çəkir.

ملا نصر الدین

№24 Qiyməti 12 qəpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. №24




Litoq. S.Bıxova

Bari pərvərdigara, nə başımda bir şey var, nə cibimdə.
Bircə ümidim sənə və sənin müsəlmanlarınadır.



Bu günlərdə Tiflisdə qaradovoylar İran fəhlələrindən bir çoxlu «orax» adında əsləhə tutdular.
Задержание массы «оружия» (земледельческого) въ 6 уч. гор. Тифлиса (изъ. хроники).

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada: 12 aylığı – 5 manat
6 aylığı – 3 manat
3 aylığı – 1 manat 60 qəpik

Əcnəbi məmləkətlərdə: 12 aylığı – 6 manat
6 aylığı – 4 manat

Nüsxəsi idarəmizdə – 10 qəpik,
Özgə şəhərlərdə – 12 qəpik.



**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24*
*Тифлисъ, Давидовская ул., д. № 24.*

Редакция журнала «Молла Насреддинъ»

Teleqram üçün adres: Tiflis, «Molla Nəsrəddin»ə
Тифлисъ, «Молла Насреддинъ».

Elan qiyməti:
Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

8 cəmadiyəl-axər 1327, bazar — həftədə bir dəfə çıxan türk məcmuəsidir — 14 iyun 1909


**«Molla Nəsrəddin»in əvvəlinci, ikinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 5 manat, ikinci və üçüncü ili 6 manat, boş cildi 70 qəpik; poçta xərci ilə: əvvəlinci ili 6 manat, ikinci və üçüncü ili 7 manat, boş cildi 1 manat.**

## NEÇÜN VERMİYOR?

Bircə bu məşrutəni şah neçün vermiyor?
Gah verir filməsəl, gah neçün vermiyor?

Gərçi bu gün şah bizim başımıza sayədir,
Nami-humayuni hər mətləbə pirayədir,
Leyk bu ancaq haman gördüyümüz qayədir,
Hər səsə bir səs verir, kəndisi bimayədir.
Yoxsuza olmaz demək var....
neçün vermiyor?
Bircə bu məşrutəni şah neçin vermiyor?

Hərzə danışma, kişi, gözlə ədəb zinhar,
Şahımızı bilmə çox böylə səfahətşiar,
Əqli-səlim əhlidir büsbütün ali-Qacar,
Vermiyor əlbəttə, bir hikməti var, sirri var.
Yoxsa bu keyfiyyətə rah neçün vermiyor?
Gah verir filməsəl, gah neçün vermiyor?

Yox bu işin başqa bir hikməti ya mikməti,
Əyri otur, düz danış – vazeh edək söhbəti,
Bir kərə al boynuna: var yazığın nikbəti,
Şahi-cavanbəxt isə bəs nə səbəb milləti
Həftədə bir aldadır, gah neçün vermiyor?
Bircə bu məşrutəni şah neçün vermiyor?
Gah verir filməsəl, gah neçün vermiyor?

*Əbunəsr Şeybani*







---

## YOL

Yadındadırmı, əzizim, ki həmişə mən sənə deyirdim, dayan, qardaş, o yol ilə getmə, qayıt geri, peşiman olarsan?

Sən mənə cavab verirdin ki, yox, yox, gərək bu yol ilə gedəm, bu yol məni aparıb çıxardacaq gülüstana.

Mən deyirdim: getmə, qayıt geri, o yol ki sən gedirsən, gülüstan yolu deyil, o yol səni aparıb çıxardar qəmişliyə, orada qabanlara rast gəlib puç olarsan.

Yadındadırmı ki, sən mənim üstümə hirslənib istiyirdin ki, hələ məni vurub öldürəsən də.

Mən deyərdim getmə, sən deyərdin gedəcəyəm.

Əzizim, o vədə sənin haqqın var idi mənim üstümə hirslənməyə, o səbəbə ki, sən o yolu gülüstan yolu bilirdin və bunu da yəqin eləmişdin və çünki bunu yəqin eləmişdin, yolundan geri durmaq istəmirdin.

O vədə sənin haqqın var idi.

Amma indi gəlib çıxdın qəmişliyə.

Dəxi indi sözün nədir?

* * *

Nəsihəti-hükəma: Heyvan heyvanlığı ilə bir yoldan keçib yıxılanda dəxi bir də o yerdən keçmir.

Sən ki Allaha şükür insansan?..

*«Dəli»*

## İRƏVANDAN MƏKTUB

Cənab Molla Nəsrəddin! Siz keçən nömrələrin birində yazmışdınız ki, İrəvan gimnaziyasının müsəlman şagirdləri başlayıblar bir-bir gimnaziyadan yarımçıq çıxıb getməyə.

Biz lazım bilirik sizə bu yolda cavab verək. Doğrudur, biz bir neçə nəfər İrəvan gimnaziyasının dördüncü və beşinci klasından yarımçıq çıxdıq.

Amma çıxmağımızın səbəbi var. Dünyaya məlum olan bu bir həqiqətdir ki, insan gecə-gündüz çalışır ki, özünə ruzi qazansın. Dərs oxuyanlar da elə bu qəsd ilə oxuyurlar. Əgər bu qəsd ilə oxumasalar, elədə gərək həkimlər naxoşa müalicə edəndə naxoşdan pul almıyalar, vəkillər dövlətli dustaqlardan pul almıyalar.

Bütün İrəvanın əhli buna şahiddir ki, biz yarımçıq dərsdən qaçanlar İrəvanın ən dövlətli şəxslərinin oğlanlarıyıq və əgər Allah qoysa, bu dövlət bizə də çatar, bizim övladımıza da kifayət edər. Elədə bir bizi başa sal görək, dəxi nəyə lazımdır oxumaq. Əgər desən ki, elm şirindir, biz də sənə deyərik ki, bağışlayın, qumar elmdən də şirindir, bu sözlərimizə də isbat budur ki, məsələn, klubda qumar oynuyanlar sübhə kimi qumardan ayrıla bilmirlər və heç kəs görmüyüb ki, klubda bir nəfər adam səhərə kimi kitab ya qəzetə oxusun.

Biz də bunu yaxşı başa düşüb gimnaziyadan çıxdıq və şəhərin kənarında bir qumarxana açdıq, xülasə, dəxi bunun mətləbə dəxli yoxdur, sözümüz oradadır ki, sağ olsun dövlət qazanan atalarımız: dəxi nəyə lazımdır oxumaq?

*İmza: Bir neçə nəfər gimnaziyadan çıxan.*

---

## TƏZƏ QƏRARDAD

İndiyədək qayda belə idi ki, iranlıların məktəblərinə müəllim təyin olunanda müəllimlər hər bir yerin öz əncüməni tərəfindən təsdiq olunurdular. Amma bu qayda pis nəticə bağışladı. Belə ki, axırda məlum oldu ki, müəllimlərin bir parası batinən bədetiqad imiş və şagirdlərə deyirmişlər ki, «gündə bir dəfə dəllək dükanına girib başınızı qırxdırmayın».

Bu səbəbdən indi belə qərar qoyuldu ki, hər bir məktəb üçün müəllim təyin olunanda əvvəlinci şərt budur ki, haman müəllim qabaqca gedib Vladiqafqaz əncüməninden təsdiqnamə gətirsin.

Əgər bu qərardada əməl olunmasa, müəllim heç bir vaxt qəbul olunmayacaq.

*Həpli həpo*

---

## ƏZİZ

Molla əmi! Doğrusu, qabaqdan hər nə yazırdın, ona mənim bərk acığım tuturdu. Bir vaxt yazmışdın ki, mən dünyada qaradovoydan çox bərk qorxuram. Bunu oxuyanda acığım lap bərk tutdu. Öz-özümə dedim ki, a kişi, adam da qaradovoydan qorxarmı? Qaradovoy nədir ki, ondan qorxasan. Küçələrə qaradovoy ondan ötrü qoyulubdur ki, iki dalaşanı aralaşdırsın və gecələr camaatın malını gözləsin. Amma Molla dayı, indi utana-utana öz səhvimi boynuma götürürəm. İndi baxıb görürəm ki, dünyada əsl qorxası budur. Hərgah bircə dəfə Gəncənin bazarbaşısının qaradovoylarını görsən, qorxundan bir də Gəncəyə gəlməzsən. Bizim şəhərin bazarbaşında bir Əziz adlı qaradovoy var, lap Məhəmmədəliyə cəllad olasıdır. Bu saat ondan Gəncədə bir nəfər qorxmuyan adam yoxdur. Hamı qorxur. Hətta bizim İran konsulu da qorxur. Gündə boş yerə əlli həmşərini döyüb, başını-gözünü yarıb, konsulxanaya göndərir, amma konsul ağa qorxusundan heç səsini çıxartmır. Hamı qorxur, hamının gözünün qabağında gündə bu qədər adam döyüb, aparıb, dustaq eliyir. Amma... nə olursa genə bir gündən sonra buraxır. Heç kəs dinmir. İstədim ki, mən genə də qorxmuyam, amma gördüm ki hamı qorxur, mən də qorxmağa başladım. Molla dayı, olmuya bu yazdıqlarımı jurnala yazasan! Birdən Əzizin qulağına çatıb, gəlib səni də döyər. Yazma, aman günüdür yazma! Birdən acığı tutub, bazar başında bunun hərəkətlərinə gündə tamaşa edən böyüklərin də, bəlkə də konsulun özünün də baş-gözünü vurub dağıdar. Yazıqdırlar, qoy rahat oturduqları yerdə otursunlar.

Burasında da arxayın ol ki, yüz il də belə etsə, nə konsulda və nə də qeyrilərində cürət olub, yerinə deməyəcəklər. Qərəz, qalanlara yazığın gəlsin. Jurnala yazma.

*Əz tərəfi-dostunuz Yoncasatan.*

---

## ELAN

Cümə günlərində dövlətli müsəlman qardaşların dilbilməz cavan oğlanların iyirmi beş sinnəcən qəbul eliyirəm öz şən-şövkətimdən ötrü, yağış yağanda öz dövlətxanamızda, hava xoş olanda yaxşı dilgüşa bağlarda sup, kabab, qaymaq və qeyrə... verməyə hazıram. Bəşərtiha qumarda sərf olunan pullardan gündə qırx manatdan əlli manatacan gərək bəndəni sərəfraz eliyələr. Həvəsli olan müsəlman qardaşlar bu adresə buyursunlar. Adres: Şirvanın gürcü bazarında, cavanları qumarə təhrik eliyən cənab müstətab xeyrəlhac Çopur Hacı İbrahim.

*Qırxayaq*

---

## HACI

Lənkəran kimi bir müsəlman şəhərində həcci-əkbər qılmış, mahi-ramazanda qəzetə oxumağı haram bilən bir hacı fəqir kəndlinin kəbinli arvadını indi alıb evində saxlıyıb. O arvadın köməksiz, biçarə ərini kəsbkarından avara edib və Lənkəran əhli də hacının bu əməlini əlbəttə, xoşluyur ki, bir söz demir. Ələlxüsus, şəriət qeyrətini hamıdan artıq çəkən, «Behcət» mədrəsəsini haram bilən Molla Abbasqulu cənabları da əsla bu işə əhəmiyyət verməyib sümbəkum durub bir kəlmə danışmaq istəmir və buna səbəb budur ki, haciyi-məzkurun ətəkləri çox uzundur, qurşağı yoğun, başmağı dikdaban, saqqalı, dırnaqları həmişə rəngi-hənalı, camaat namazı qılan, əlində təsbehi-səddanə, ağzı dualı, gözü yaşlı və qəzetə oxumağı haram bilmək ilə isbati-islamiyyət edib. Əlbəttə, belə şəxs müqəddəsdir, çünki bəqövli-axund, zahirdə müsəlman olmaq, yəni yuxarıda söylədiyim nişanələrdə yaşamaq kifayətdir. Əməli-batini migüzər, Allah var, rəhmi də var, tövbə qapısı açıqdır. Əgər ehyanən bir nəfər ficətən ölüb tövbə etməsə, ona da çarə vardır. Molla Abbasqulu axund bir kağız yazar, qırx nəfər tüllab və ya müqəddəslərə möhürlədər, yəni qırx nəfər axund mütabət edib şəhadət verir ki, bu kişi pak müsəlmandır. Cənab axund o kağızı, yəni «svidetelstvanı» qəbrə qoyar mərhumun sinəsi üstə və Allah-taala bəmövcibi-şəhadətnamə hökm edər məlaikələrə ki, haman mərhumu biduni-sual-cavab ərşi-əlayə aparıb rahat edərlər. Amma behişt əhli o şəxsə çox həsəd aparırlar. Cənab Abbasqulu axund bir neçəsini bu cür edibdir. Xülasə, gələk mətləb üstə. Bəli, lazım idi ki, üləma, nücəba belə şəriətə və insaniyyətə toxunan əmri-əzimə əhəmiyyət verib haciyi-məzkurə izhari-nifrət edib baykot edə idilər. Amma bərəks, bəlkə hacının fahiş əməlindən xoşnuddular. Müdiri-möhtərəm cənablarından təvəqqə edirəm, bu əhvalatı bəmövcibi-jurnal millətpərəstlərə yetirəsiz, bəlkə onlar da dırnaqlara həna qoymağın əsrarını öyrənələr.

*Kəşkül*

---

## TELEQRAF XƏBƏRLƏRİ

Kəblayı İsrapilbəyin təzə açdığı tənbəlxanaya Gəncə Nəşri-maarif cəmiyyətinin idarəsinin iki üzvü özlərini həmişəlik üzv yazdırdılar.

Gəncə cəmiyyəti-xeyriyyəsinin sədri gecə və gündüz çalışmaqdan əriyib, saralıb saman çöpünə dönübdür.

## LAX YUMURTA

A Molla əmi, doğrusu, heç səndən baş açmaq olmur. Bir tərəfdən deyirsən: «Ay camaat, daha aldanmıyın, üzünüzü açın, gözünüzü örtün, ağzınızı açın, dilinizi bağlayın. Qulağınızı pənbəliyin, ayağınız yalın olmaqdan eyib olmaz. Bığın qabağını aldırın, saqqal həmişə varlıda olsa fikir yoxdur. Zahirdə çoxlu namaz qılın, batində bitli də olsanız, dinin dirəgi yıxılmaz. Saç qoymuyun. Ancaq bir medala vətəni və milləti satsanız da yarar. Təharət alanda ayaq yerə döyməyi tərk etmiyin, üxüvvət şərtini tərk eləsəniz əzim savab edərsiz. Yaşı çox, özü cahil himar olsa da yarar, ancaq filosofi-zəmanə olub yaşı az olsa yaramaz. Uşqola gedib elm təhsil etməyin, «Baba Heydər məşlişə gedən» kimi pirə getsəniz düzələr. Seyidlərdən, ocuğlulardan və şeyxlərdən etiqadınızı kəsmiyin. Mərdümazar olsanız da zərər yoxdur. Qeyri millətlər sizi alverdə-filanda tovluyub pulunuzu alırlar alsın... Xülasə. Və bir tərəfdən cənabınız bir qırıq kağıza qurbağa, çaqqal, filan şəkli çəkib fəqir camaatın cibində şeyxlərdən və mollalardan artıq qalan qəpikləri tovluyub alver təriqilə alırsız. Hə, alver dedim, fikrimə Hacı Molla Qəni əfəndinin alveri düşdü. Molla əmi, and olsun Sadıqov, İsmayılov və Ciqayev Cabbarın canına. Ənbərçi kəndində Hacı Molla Qəni əfəndi ilə onun bacanağı Əfəndi Dibir oğlu təzə bir alver tapıblar. Bunlar kəşf etdikləri ticarət üsulu Kolumbun kəşfindən hünərlidir... Bunların Mahmud ağa deyən bir nəfərdə bir baldızı var, neçə kərə bu müqəddəs əfəndilər məzkurə övrəti tovlayıb öz yanlarına qaçırıb, hər səfərində Mahmud ağadan bir neçəcə manat alıb genə ona veriblər. Axırda Mahmud ağada həcəmət yeri olmadığından digər bir Mahmud ağaya satmaq mənzurilə məzkurə övrəti tovluyurlar ki, filankəsi və filankəsi şahid yazıb nahiyə suda şikayət ver ki, «Mənim ərim Mahmud ağa məni boşuyubdur, filankəslərin yanında, ancaq məni azad etməyir». Məzkurə övrət bu fitva mövcibincə nahiyə suda ərizə verir. Xülasə, arizəni və məruzi söylədəndən sonra şahidlərdən soruşur: “Bu işdən siz nə bilirsiniz? Bunlar cavab verirlər ki, “Bizim xəbərimiz yoxdur. Sud bir qədər məşvərətdən sonra fitva sahiblərinə məlum edir ki, «Yaxşı basdırmamısız, yumurta lax çıxdı...»

*Sofi zənbil*

## TİCARƏT VƏ EKONOMİ XƏBƏRLƏRİ

Bəndə Bakıda, İçərişəhərdə şah evlərinin yanında Molla Gümri məscidini kirayə eliyib oraya çoxluca köhnə qapı, akoşka və taxtalar yığmışam və ucuz qiymətə satıram. Almaq istiyənlər yuxarıdakı adresə rücu etsinlər.

*İmza: Bir nəfər hacı*

## DƏMİR TİKƏSİ
*(Bakıdan məktub)*

Molla Nəsrəddin kişi, aman günüdür, bircə bu məktubuma bir az yer ver. Sənə məlumdur ki, bu axır zamanda biz müsəlmanlar da Allaha şükür, tərəqqi eləməyi başlamışıq. Ola bilər ki, sən mənim bu sözümə inanmıyasan. A kişi, bircə gözünü aç gör hər il universitetlərdən neçə oxumuş müsəlman çıxır.

Allaha şükür, həkimlərimiz var, vəkillərimiz var, incinarlarımız var, dəxi nə istiyirsən? Sözüm burada deyil, mən onu demək istiyirəm ki, bu axır vaxtda bizim aragəzən arvadların arasına bir təzə söz düşüb. Görürsən ki, bir məclisə (hamama, yasa, ya da toya) yığılanda başlıyırlar ki, filankəsin oğlu oxuyub «nişan» alıb, amma heç biri başa düşə bilmir ki, «nişan» necə şeydir. Bu barədə məndən bir neçə xalalar çox sual ediblər ki, «nişan» nə boyda və nədən olar? Amma mən mat qalıb heç birinə cavab verə bilməmişəm. İndi ittifaq düşdü, mənə «nişan» sözünü qandırdılar.

Bir dəstə arif müsəlman övrətlərinin fikrini bu barədə yazmaq istəyirəm ki, bundan sora tərəqqipərvər bacılarım bilsinlər ki, Rusiyada gedib zəhmət çəkib oxuyan qardaşlarımız özləri ilə necə «nişan» gətirirlər.

Yaxın yoldaşlarımdan birisi keçən il Peterburq şəhərində institut qurtarıb incinarlıq elmini tamam etmişdir. Biçarə Bakıya daxil olan günü bunların evləri dönmüşdü bir karvansaraya. Tərəqqipərvər xanımlarımız yazığı qoymurdular ki, yorğunluğunu alsın. Sübhdən axşamadək gethagəl!..

Yoldaşımın anası dönmüşdü bir hacdan gələnə, çünki rəfiqim özü gedib otağında gizlənmiş idi və arvadlar anasının yanına gəlib ona gözaydınlıq eliyirdilər. O xanım gəlirdi ki, «balam, gözün aydın, oğlun oxuyub nişan alıb». Bu xanım gəlir idi ki, «balam, neçə şad günlərə çatasan, oğlun nişan alıb».

Demək lazım deyil ki, gündə neçə dəfə samavar dolub-boşalır idi. Birdən xanımlardan bir neçəsi dedi: "Balam, heç bir ağrını aldığımın nişanını axır görmədik, bir bizə göstərin görək bu nişan necə zaddır». Rəfiqimin anası gedib oğlu ilən bu barədə danışdı: "Qadanı anan alsın, qonaqlar istiyirlər sənin nişanını görsünlər, göstər görək nişanın necə şeydir». Rəfiqim əvvəl bir az şıltaqlıq elədi: «İtil cəhənnəmə, nə nişanbazlıqdır? Qoy yatıb yorğunumu alım». Amma anası əl çəkmirdi. Axırda rəfiqim cibindən bir açar çıxartdı: «Ala get çamadanı aç, oradan çıxart». Biçarə övrət əli əsə-əsə açarı götürüb getdi, çamadanı açıb içində bir balaca yastı qutu gördü və qayıdıb oğluna dedi: "Ağrını ana alsın, çamadanda nişan-zad yoxdur». Rəfiqim hövsələdən çıxdı: «O balaca yastı qutunu aç, onun içindədir», övrət təəccüb elədi: «Necə qutunun içində yəni o balaca qutunun?» «Hə, hə, elə o qutunun içindədir,» Övrət qutunu götürüb məclisə yügürdü, arvadlar yığıldılar başına, qutunu açdılar. – «Vay, vay, başınıza dönüm, burada nişan-zad yoxdur, bir dəmir tikəsindən savayı». Doğrudan, qutudan qatır nalına oxşuyan dəmir tikəsi çıxartdılar. Arvadlar barmaqlarının üstünə mindirib gəzdirib bir-birinə verdilər. Axırda qonaqlar kor-peşman getdilər. Rəfiqimin anası sakit olmuyub gəlib oğlu ilə bir yekə dava başladı: «A külbaş, beş il gedib oxudun elə naldan ötrü?».

*«Rəhmsiz»*

---

### ELAN

Yeni açdığım Darülfəsad məktəbində təzə üsul ilə fitnə-fəsad, hiylə, şeytənət, büğz, ədavət və danos dərsləri verirəm! Ucuz qiymət ilə. Xahiş edənlər Əttarlar küçəsində məktəb müdirinə rücu edə bilər. Məktəbimizin bir şöbəsi Əttarlar küçəsindədir və o birisi Toyuqçu küçəsində açılmışdır.

### ELAN

Neçə il bundan irəli Maku darülfünunu əvvəlinci dərəcədə qızıl medal ilə tamam edib və Şahtaxtı kəndində sakin olan Mirzə Ağa vəfat edib, onun şagirdlərindən Abbasqulu nam məşhur Bəhluli-Danəndə özünün ikinci nömrəli evində saat 2-dən 4-ə kimi siflis naxoşlarını qəbul edər, necə ki, neçə nəfərləri bu mərəzdən xilas etməyi məlumdur. Hər kəsə lazım olsa Şahtaxtında Bəhluli-Danəndənin 2-ci nömrəli kvartirasına rücu etsin və viziti bir girvənkə yarım qənddir. Amma gərək nəqd olsun, nisyə qəbul etmir.

*Dabanı əyri*

### POÇTA QUTUSU

Culfada «Məxsusi müxbir»ə: Gömrükxana barəsində yazdığınızdan doğrusu, başa düşə bilmədik ki, rəisin təqsiri nədir. Əgər mümkündürsə, sözü açıq yazın. Sizə inanarıq və çap elərik.

Ağdaşda «Arsız»a: Hər nə yazırsınız, hamısına inanırıq, lakin müəllimin haqqında o ağırlığında töhmətli sözləri çap edə bilmədik.

***

Sabunçuda «Balaca Zubalax»a: Xəttinizi oxuya bilmədik.

***

Nuxada «Rəşbər»ə: Nur əfəndinin barəsində yazdıqlarımız dəxi bəsdir.

***

Gəncədə «M.H.» cənablarına: Göndərdiyiniz elan sizin xüsusi işinizdir. İmzadan sora çap oluna bilər, əgər xəbər verdiyimiz şərtlərə əməl olunsa (yəni pul ilə).

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

Hacıtərxanda kitabxana sahibi Əl-Müqayifə təklif edirik ki, bizə borclu olduğu, 25 manat 50 qəpiyi göndərsin idarəmizə.

*«Molla Nəsrəddin» idarəsi tərəfindən*

## ELANLAR

### MÜSƏLMAN TEATRI

Bazar günü, iyunun 14-də cənab Ərəblinskinin teatr dəstəsi tərəfindən Tiflisdə Kazyonnı teatrda məşhur «Nadir şah» faciəsi mövqeyi-tamaşaya qoyulacaq. Faciənin müsənnifi məşhur faciənəvisimiz Nərimanov cənablarıdır.

### Moyratsitin

Leopold Stolkind və şürəkasının dərman karxanasından

Vaxtsız zəiflik və nerv azarları üçün əla müalicədir.

Çox həkimlər tərəfindən imtahan olunub, həmişə işlənən və azarlılar içində artıq şöhrət tapan dərmandır.

Hər yerdə satılır. Qiymətləri ancaq iki manatdır.

*Adres*: əsil anbarı Moskvada, Nikolskaya küçədə, nömrə 10.

Москва, Никольская, 10. Леопольд Столкинд и Ко.

Berlin, 0,27. Sehicklerstrasse, №6. Şöbəsi Berlində.

### TƏZƏ AÇILAN MÜALİCƏXANA

«Тифлисская частная лечебница»

Вокзальная 8, д. Энфиаджианца, телефон 695.

İ.Q.Fyodorov – İçəri və uşaq azarının həkimi. Qəbul edir hər gün çaharşənbə və bazardan savayı saat 11-dən 12-dək.

V.D.Qambaşidze – İçəri və uşaq azarı. Hər gün bazardan savayı saat 12-dən 1-dək.

B.A.Popov – Boğaz, burun və qulaq həkimi. Hər gün bazardan savayı 12-dən 1-dək.

Q.M.Makarov – İçəri və uşaq azarlarının həkimi. Tək və cümə günləri 1-dən 2-dək.

A.N.Diasamidze – Siflis, dəri və süzənək, 11 yarımdan 12 yarımadək.

N.M.Melikov – Cərrahlıq və övrət azarları. Hər gün 1-dən 2-dək.

İ.Q.Qomarteli – İçəri və uşaq azarı. Hər gün 2-dən 3-dək.

V.S.Musxelov – Göz azarı. Hər gün bazardan savayı 2-dən 2 yarımadək.

**Axşamlar**

A.Q.Mirzoyev – İçəri və uşaq azarı. Hər gün bazardan savayı 5-dən 6-dək.

N.Q.Çiçinadze – İçəri və uşaq azarı. Hər gün bazardan savayı 6-dan 7-dək.

Müalicəxanədə hər bir azar elm yolu ilə təhqiq olunur. Habelə çiçək döyülür və əmzikli övrətlərə də baxılır. Məsləhətə gələnlərdən 50 qəpik alınır.

### BADKUBƏDƏ MEHMANXANEYİ-«İSLAMİYYƏ»

Гостиница «Исламия» в гор. Баку

Nömrələrinin qiyməti 1 manatdan 5 manata qədərdir. Aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamıza bir dəfə gəlib görmələri rica olunur. Pasportsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.

Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-İslamiyyə.

Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.

Баку, Губернская ул., номера «Исламия», телеф.1251.

### «TƏHRİRƏL-MƏRAH» VƏ «ƏLMƏRAHÜL-CƏDİDƏ»

Alimi-məşhur Qasım bəy Əmin ərəbcə yazdığı və ədibi-möhtərəm Zakir Əlqadiri cənabları türk dilinə tərcümə etdiyi həmin kitablar xanımları əsarətdən qurtarmağa dair şirin dil və mənalı dəlillər ilə bəhs edirlər.

Övrətlərin azadlığını arzu edənlərə bu kitabları alıb oxumağı məsləhət görürük. Hər birinin qiyməti 35 qəpikdir. Xahiş edənlər Orenburq quberniyasında Orsk şəhərində Əhməd Əlishaqi cənablarından istəsinlər.

г.Орскъ, Оренбургск. губ., Ахмеду г.Исхакову.

## İDARƏMİZDƏ SATILAN KİTABLAR

| *Kitabların adları* | *Yazanlar* | *Qiymətləri* idarədə | poçta xərcilə |
|---|---|---|---|
| Dərs kitabları: | | | |
| Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dərs kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dərs kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dərs kitabı | «-» | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: Təşrihəl-fəraiz | Axund Ərəszadə | 1 man. | 1 man. 16 qəp. |
| Rüstəm və Söhrab (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1 man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbutürab mərhum, Ə.Hüseynzadə, Faiq Nemanzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (şəkilli) | «-» | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (şəkilli) | «-» | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir və məbdəi-tərəqqi (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıbzadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | «-» | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | «-» | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | «-» | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | «-» | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıbzadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | «-» | 5 qəp. | 5 qəp. |
| Asari-Əhmədbəy Cavanşir (milli şer məcmuəsi) | «-» | 25 qəp. | 30 qəp. |
| Hesab məsələləri | Həmidbəy Yusifbəyov | 35 qəp. | 41 qəp. |
| Söhbət basərrəfiqəm | Şair Nəyyir | 40 qəp. | 40 qəp. |
| Mirati-vətən | Şair Nəyyir | 10 qəp. | 10 qəp. |
| Vətən və hürriyyət | Səid Ordubadi | 7 qəp. | 7 qəp. |
| Azadə danışmaq | Volgenşteyn | 5 qəp. | 5 qəp. |
| Qəflət | Səid Ordubadi | 10 qəp. | 10 qəp. |

Nalojnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.

Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik.

Новая книга: Атрпетъ. **Мамед Али шахъ,** Современная Персия.

Продается въ Тифлисе; книжная торговля Гуттенберг, Александрополь, типографія «Ширак", Цена 1 руб. съ пересылкой.

Rus dilində təzə kitab. Yazan: Atrpet. Məhəmmədəlişah (İranın indiki halı).

Satılır: Tiflisdə Quttenberq kitabxanasında və Aleksandropolda «Şirak» mətbəəsində, qiyməti poçta xərci ilə bir manatdır.

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır. Parapetdə Varanovski-Vrangelski küçələrin küncündə, Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

Jurnalın hər bir nüsxəsinin qiyməti Ələkbərovun dükanında 12 qəpikdir, Əldə satanlarda 15 qəpikdir.

Elan və abunə qəbul etmək üçün də vəkilimiz həmin Məşədi Əyyub Ələkbərovdur.

### ELAN

1) «Hesab məsələsi» (Zadaçnik). Bu kitab məktəblərdə və evlərdə hesab təlimi üçün tərtib olunub, 761 hesab məsələsini, 237 təlimati-rəqəmiyyəyi və Rusiyada istemal olunan ölçüləri və ölçülərə dair təlimləri havidir. Qiyməti 35 qəpikdir.

2) Gündəlik dərsləri yazmaq üçün yövmiyyə dəftəri (Dnevnik).

Şagirdlərə gündəlik, həftəlik, aylıq və illik nömrələr qoymaq və dərsləri yazmaq üçün cədvəlləri və bəzi digər məlumatı havidir. Qiyməti 30 qəpik.

Bu kitabları almaq istəyən müəllimlərə və kitabçılara böyük təfavüt qoyulacaqdır. On ədəddən əskiyinə poçta markaları qəbul olunur. Xahiş edənlərə naloj ilə göndərilir.

Adres: Gəncədə Həmidbəy Yusifbəyova.

### ELAN

Kitabxanamızda hər cür məktəbə və maarifə dair kitablar mövcuddur. Kitabi-Təşrihəl-fəraiz, Risaleyi-ribdətül-əhkam, Ümdətül-əhkam.

Səyahətnameyi-İbrahimbəy. Külliyyati-prins Mirzə Mülkümxan.

Tərcümeyi-töhfeyi-Nəsuhiyyə və təfsirəl-Quran əsəri-Mollazadə və Təbrizin xəritəsi 60 qəpiyə və Kitabi-tacüt-təvarix Əmiri-əfğan Hacı Ələsgər Məmmədzadeyi-kitabfüruş dükanında satılır.

# МОЛЛА НАСРЕДИНЪ

Контора и редакция журнала «Молла Насрединъ»
Тифлисъ, Давидовская ул., д. № 24

Еженедельный политико-сатирическій и художественный журнал

Цена за годъ
Съ доставкою 5 руб.
За границу 6 руб.
Цена за объявления: За место занимаемое строкою петита впереди текста–10 коп., позади текста–7 коп.

II




Cavan türklərin səfəri
Путешествие младотурокъ.




Bu əşqiya ki gedir Kərbəla ziyarətinə,
Necə davam edəcək Kərbəlada şahi-şəhid.
Ki, bir Yezid cəfasın unutmamış hala,
Açıb gözün görəcək nagəhan həzar Yezid.